**VÜSAL XOYLUYEV**

# Unutmayaq ki, unudulmayaq

**Faxralı elinin izi ilə...**

***Kitabın satışından əldə edilən maddi vəsait Faxralı kənd icmasının təşəbbüsü ilə həyata keçirilməsi nəzərdə tutulan sosial yönümlü işlərin həyata keçirilməsinə xərclənəcəkdir.***

***Bakı - 2010***

Baş redaktor: Əlövsət Sadıqov,
biologiya elmləri namizədi,
dosent

Redaktor: İsrafil Səmədoğlu
Korrektor: Elxan Sadıqov
Kompüter
tərtibatçısı: Sevinc Hacıyeva

Nəşriyyat redaktoru: Ə.Ə. Zahidov

**VÜSAL XOYLUYEV «Unutmayaq ki, unudulmayaq»**
**Faxralı elinin izi ilə**.........səh.323

***"Unutmayaq ki, unudulmayaq" kitabı Xoyluyev Vüsal Sərraf oğlunun ilk qələm təcrübəsidir və qiymətli tədqiqat əsəridir. O, gənc müstəqil tədqiqatçı kimi Faxralı kəndinin tarixini, sənətkarlığını, toponimiyasını araşdırmağa çalışmış və buna nail olmuşdur. Öz el-obasını dünyada tanıtmağa çalışan, əmək adamlarının, elm, dövlət xadimlərinin, səhiyyə, təhsil işçilərinin, müharibə və əmək veteranlarının həyat və fəailliyətlərinin hərtərəfli mənzərəsini kitabda ustalıqla qələmə almışdır. Kitabda istər bu kənddə və istərsə də onun hüdudlarından kənarda yaşayan, qurub-yaradan, millətsevər, vətənpərvər, torpağa, yurda bağlı insanların bioqrafik məlumatlarla zənginləşdirilmiş portretləri öz əksini tapmışdır. Kitab mövzu ardıcıllığına görə çox maraqlıdır. Ümidvarıq ki, bu kitab geniş oxucu kütləsi tərəfindən sevilə-sevilə oxunacaqdır və hamının stolüstü kitabına çevriləcəkdir.***

**«ƏSGƏROĞLU»** nəşriyyat və poliqrafiya MMC-nin

**Direktoru Ə.Ə. ZAHİDOV**

# Baş Redaktordan

Bəşəriyyət topladığı təcrübəni qorumaq və gələcək nəsillərə ötürmək üçün yazını, sonra isə kitab nəşrini kəşf etdi. Kitab bilik mənbəyidir. Kitab dedikdə ilk öncə gözümüz qarşısında Allahın peyğəmbərlər vasitəsilə xalqa çatdırdığı müqəddəs kəlamlar, sonra isə peyğəmbərlərin varisləri olan alimlər, eləcə də Allahın sevimli bəndələri olan şairlərin, yazıçıların yazdıqları elmi və bədii əsərlər canlanır. Odur ki, kitab yazmaq böyük şərəf, həm də böyük məsuliyyətdir. Vüsal müəllim çox şərəfli, çətin, məsuliyyətli bir işin öhdəsindən gəlmək üçün böyük əmək sərf edib, uzun axtarışlar aparıb və istədiyinə nail olub. O, Faxralı kəndi, onun sakinləri, əmək adamları, ziyalıları haqda ətraflı məlumat toplayıb, yeri gəldikcə tarixi sənədlərə, şahidlərin söylədiklərinə söykənərək dəyərli nəticələr çıxarıb və oxucunu düşünməyə vadar edə bilir. Kitabda nəsil şəcərələrinin verilməsi onun qiymətini daha da artırır. Faxralıların çox qədim tarixlərə bağlılığı da inandırıcı səslənir, çünki onsuz da insan insandan törəyib və təbii ki, Faxralılar da tarixin hansı dönəmindəsə hər hansı bir qövmdən, tayfadan ayrılıb, başqa yerdə məskunlaşıb və həmin toponimi yaradıblar, ya da hazır gətiriblər. Mən 50-60 il bundan qabaq çox yaşlı adamlardan kəndin camaatının haradan gəldiyini soruşanda əksəriyyət deyirdi ki, Qazax Faxralısından gəliblər. Bir də Faxralılar söyləyirdilər ki, onlar mifik qadın obrazı kimi tanınan Faxra nənənin övladlarıdırlar və yağışdan sonra yaranan göy qurşağını ziyarət edirdilər ki, Faxra nənə bizi salamlayır.

Kitabda Kürəkbasanda olan vergi ödəyiciləri Faxralıların siyahısı verilib, lakin bu gün Faxralıda yaşayan nəsillərlə onların əlaqəsini müəyyən etmək mümkün olmayıb. Odur ki, müəllif XVII, XIX əsrlərdə Türklər və Ruslar tərəfindən aparılmış siyahıya alma işlərinin və tərtib edilmiş müfəssəl dəftərlərin tədqiqi ilə məşğul olmalı və mümkün əlaqələri bərpa etməyə çalışmalıdır.

Faxralıda yaşayan həvəskar şairlərin şeirlərindən də nümunələr verilmişdir ki, bu da onu oxuyanların mənəvi istirahətinə kömək ola bilər.

Ümumiyyətlə "Unutmayaq ki, unudulmayaq" kitabı Faxralılar haqda qiymətli, dolğun bir qaynaqdır, elmi əhəmiyyəti olan məxəzdir (mənbə) və ondan tarixçilər, müəllimlər, tələbələr, şagirdlər istifadə edə bilərlər. Müəllifə bu nəcib, xeyirxah, dəyərli işinə görə təşəkkür edirəm və ona cansağlığı, yeni-yeni yaradıcılıq uğurları arzulayıram.

**Baş redaktor, biologiya elmləri namizədi, dosent**
**Əlövsət Sadıqov**

# Tariximizin bir damlası
## *və ya tarixə uzanan cığır*

Dünyanın görkəmli adamları bir məsələdə həmfikirdirlər ki, "türklər böyük tarix yaradan xalqlardandırlar." Təəssüflər olsun ki, tarix yaratdıqları halda onun tarixinin yazılmasına müxtəlif məsələlərlə əlaqədar olaraq o qədər də əhəmiyyət verməmişlər. Həqiqət bundan ibarətdir ki, uzun illər tarix qılıncla yaradılıb. Türklər, o cümlədən Azərbaycan türkləri döyüş meydanlarında sözlərini qılıncla dedikdən sonra istisnalar nəzərə alınmazsa onun sözlə ifadə edilməsini lazım bilməmişlər. Bir məsələni də qəbul etməliyik ki, türklər tarixlərində o qədər böyük, əsrarəngiz tarix yaratmışlar ki, üzərindən bu qədər zaman keçməsinə baxmayaraq onun əzəməti hələ də azalmamışdır.

Azərbaycan tarixi uzun illərdir ki, yazılır. Uğurlarımız da var. Tariximizin müxtəlif dövrləri heç də eyni dərəcədə tədqiq edilməmişdir. Siyasi tariximizin tədqiqinə nə qədər çox əhəmiyyət versək də, opponentlərimiz-bədnam qonşularımız bizə tez-tez etnoqrafik, toponimik, arxeoloji "cəbhələrdən" hücumlar edir, Qafqaza gəldikləri günün tarixi bəlli olsa da tarixi ərazilərimizə hər fürsətdə sahib çıxmağa çalışırlar. Tarixə bu bucaq altında baxıldıqda aydın olur ki, faktiki olaraq ermənilər müxtəlif ərazilərimizi əsassız olaraq erməniləşdirməyə çalışırlar. Doğrudur, Azərbaycan tarixçiləri son dövrdəki tədqiqatlarında bu kimi əsassız iddialara əsaslı cavab vermişlər. Lakin siyasət elmi olan tarix elmində hər hansı bir məsələyə son nöqtə qoymaq mümkün deyildir. Tarix elmində

iddialarını bütün zamanlarda qəbul etdirə bilmək üçün tədqiqatlarında tərxis gözləməyən əsgər olmalısan. Bu mənada azərbaycanımızın hər qarışı ciddi şəkildə tədqiq edilməlidir.

Tarixin yazılmasında müxtəlif formalar vardır. Onlardan biri də ölkə ərazisinin ayrı-ayrı hissələrinin tarixinin hazırlanması və onlarda aşkar edilən faktlardan bütöv tarixin yazılmasında istifadə etməkdir. Bu mənada tarixi mənbələrə "Kürəkbasana daxil olan Faxralı camaatı" ifadəsi ilə daxil olan Faxralı kəndində də tariximizin şanlı səhifəsinə daxil olacaq hadisələr vardır.

Müəllif Faxralı kəndinin coğrafiyasını verərək tədqiqat yoluna çıxır. Arxeoloji qazıntılara və onların nəticələrinə çox diqqətlə yanaşır və onlardan maraqlı nəticələr çıxarır. Faxralının tarixinə aid şəcərələr verilir ki, onlar əsasında müəllifin əldə etdiyi nəticələr qəbul ediləndir. Faxralıların yayılması ilə əlaqədar gətirilən fikirlər insanı tarixin müxtəlif dövrlərinə "aparır", oxucunu müəllifin tezislərinə inandıra bilir. Bir sıra hallarda müəllif tarixə "səyahət edir", Faxralı torpaqlarının əldən-ələ keçməsini faktlarla da göstərir. Bunları kitabı şirinləşdirən tarixin şəkər tozları hesab etmək olar. Maddi mədəniyyət abidələrinə, o cümlədən məscidlərə aid gətirilən faktlar və gəlinən nəticələr tariximiz baxımından xüsusi əhəmiyyət kəsb edir. Kitabda repressiya qurbanlarının siyahısı verilir. 1941-1945-ci illərdə Böyük Vətən müharibəsinə gedənlərə və son illərdə Azərbaycanın ərazi bütövlüyü uğrunda mübarizədə şəhid olanlara aid verilən faktlar vətənpərvərlik baxımından çox əhəmiyyətlidir.

Faxralı kəndinin tariximizin bütün dövrlərdəki izinin axtarışını uğurlu hesab etmək olar. Dünyaya gələn normal insanlar tarixdə iz qoymağa, xalqına, mənsub olduğu camaata xidmət etməyə çalışıblar. Tarixdən bəlli olan budur ki, buna nail olanlar istər kənddə, istər bölgədə, istərsə də Azərbaycanda az olmamışdır. Buna görə də müəllifin faxralıların "izini" axtarması və çox xeyirxah tapıntıları insanın xidmətinin tarixdə yaşamasının çox mühüm nümunəsidir. Bu kimi qiymətləndirmələr insanı daha çox xidmət etməyə istiqamətləndirir. Bizim də xeyirli olsun demək borcumuzdur.

**Tarix elmləri doktoru, professor**
**Həsənbala Sadıqov**

# Bir kəndin dünəni və bu günü

"Unutmayaq ki, unudulmayaq" kitabı bir kəndin dünəni və bu günü haqqında yazılsa da, özündə bütün Azərbaycanı əks etdirir.

Dünyada hal-hazırda, internetin və saysız hesabsız telekanalların olduğu dövrdə əlinə qələm alıb anadan olduğu kənd haqqında tarixi faktları, eşitdiklərini və gördüklərini aid olduğu nəslin adından gələcək nəsillərə ötürmək üçün kitab yazmaq çox böyük bir işdir. Bəlkə də şücaətdir.

Müəllifin kəndin adının etimologiyası ilə əlaqədar apardığı tədqiqat, onun güclü məntiqə malik olduğuna dəlalət edir. Mənim fıkrimə görə müəllifin Faxralı adının etimologiyasının "Fəxri Xəli" sözündən yaranması həqiqətə daha yaxındır.

Müəllif tutarlı tarixi faktlarla Faxralı kəndinin qədim tarixə malik olduğunu ortaya qoyur.

Kitabda "Faxralı" xalçasının təsviri doğrudan da onunla fəxr etməyə əsas verir. Müəllif xalçaçılıqla bağlı apardığı tədqiqatlarla öz doğma Faxralı kəndi ilə kifayətlənməyib, Gəncə və Gəncəbasar ərazilərində də axtarışlar aparmışdır. Onun qədim xalçalarda istifadə olunan rənglərin solmaması ilə əlaqədar göstərdiyi faktlar diqqətə layiqdir. Xalçaçılıqda və başqa sahələrdə bu məsələ çox aktualdır.

Kitabda, Faxralı kəndinin qədim Azərbaycan yaşayış məs-gənlərindən biri olması arxeoloji tapıntı nümunələri ilə sübut edilir. Müəllif öz kitabında bir çox tarixi hadisələrə də işıq salır, onların təsiri nəticəsində baş verən dəyişiklikləri göstərir. Məsələn, belə ki Faxralı əhalisinin Borçalı mahalı ilə bağlı olması, əhalinin oradan köçüb gəlməsini göstərir.

"Unutmayaq ki, unudulmayaq" kitabının aktuallığı bir də ondadır ki, oxucuya orta əsrlər Azərbaycan kəndinin bütöv bir təsvirini çatdırır. Gəncə yaxınlığında yerləşən Faxralı kəndinin əhalisinin bir hissəsi müharibələrdən bezərək başqa diyarlara köçməsi kitabda verilmişdir. Müəllifin böyük zəhməti nəticəsində Faxralı kəndininin bütün tayfa və coğaları haqqında geniş və dərin məlumatlar bu günkü və gələcək nəsillərə çatdırılır.

Kitabda Azərbaycan tarixinin tale yüklü dövrləri Faxralı kəndinin timsalında çox gözəl verilmişdir. Burada Qədim dövr, Orta əsrlər, Çar Russiyasının Qafqazı, o cümlədən Azərbaycanı işğal

etməsi, Azərbaycan Xalq Cumhuriyyəti, Sovet dövrü və XX əsrin sonlarında bərpa olmuş müstəqillik dövrü öz əksini tapmışdır.

Bu dəyərli kitabda azərbaycanlıların adət və ənənələri Faxralı kəndinin təsvirində çox gözəl verilmişdir. l919-cu ildə açılmış ilk məktəb, 1920-ci ildə ilk uşaq baxçası müəllifin diqqətindən kənarda qalmamışdır.

Kitabda diqqəti çəkən məqamlardan biri də Azərbaycanın inkişafında xidmətləri olan əslən Faxralıdan olan insanların şəkillərinin və onların haqqında məlumatların verilməsidir.

"Unutmayaq ki, unudulmayaq" kitabının ali və orta ixtisas müəllim və tələbələri üçün metodiki vəsait kimi istifadəsi yaxşı olar.

Bu kitab Faxralıya və faxralıların adına ucaldılmış əbədi-yaşar bir abidədir.

**GDU - nin dosenti, fılologiya elmləri namizədi**
**Əjdər Əsgər oğlu Əsgərov**

***Biz türklər çox qəribə adamlarıq; bizə görə bilmək, başqalarını öyrənmək və bizdən uzaq olan şeyləri anlamağa çalışmaqdır. Özümüzü öyrənmək heç ağlımıza gəlməz; özümüzü bir varlıq saymırıq.***

***Böyüklərini tanımaq hər millətin borcudur. Kimsə kimsəyə "Sən atanı tanıma, sən babalarının dünyadan necə gəlib keçdiklərini öyrənmə, sən əski atalarının adlarına, sanlarına maraq göstərmə!"- deyə bilməz. Deyərsə, ən təbii haqqa toxunmuş və ən böyük bir haqzızlıq etmiş olar. Özünü və öz böyüklərini tanımağa çalışmaq millətin vəzifəsidir; bunu etməyən bir millət nümayəndəsi milli vəzifəni yerinə yetirməmiş hesab olur.***

***Görkəmli Türk Alimi Bəsim Atalay (1882-1965)***

# Müəllifdən

Hörmətli oxucum! Bu kitabı bir dəfəyə oxuma. Burada nə məhəbbət macarası var, nə də fantaziya. Bu kitabın hər vərəqində Goranboy rayonu Faxralı kəndinin tarixindən səhifələr, faxralıların keçdikləri şərəfli döyüş yolu, düşmənə qarşı amanslz olmaq, ictimai fəaliyyət və ömür yolu var. Faxralılar, unudulmuş yaddaşlarınız ayılsın! Ayılsın ki, keçmişimizdən bu günümüzə kimi tariximizi özündə daşıyan və bizi dünyada təmsil edən "Faxralı" xalçasını düşmənlərimiz olan ermənilər özününküləşdirməyə çalışırlar. Mənəvi və maddi dəyərlərimizə sahib çıxmasaq bizdən biz olmaz. Unutmayaq ki, unudulmayaq. Cox şükürlər ki, əxlaqi, mənəvi və maddi dəyərlərimiz ulularımız tərəfindən layiqlə qorunaraq bizlərə əmanət edilib. Biz isə bu əmanəti göz bəbəyimiz kimi qorumağa borcluyuq. Dünyamızın qloballaşan dövründə özünü itirənlər uduzurlar. Gəlin biz olduğumuz kimi qalaraq keçmişimizin əsl xəzinədarları olaq. Bəzi xalqlar tarixi saxtalaşdıraraq "dərin tarixə malik olmaq" istəyirlər. Bizim isə tariximiz çox qədimdir. Bizim üzərimizə düşən mənəvi borc həm də bu tarixin qədimliyini qoruyub saxlamaq və gələcəyə özəlliyimizi saxlayaraq irəliləməkdir. Necə ki, atalar deyib; "ot kökü üstə bitər." Mən ulularımla fəxr edirəm, cünki faxralılar bütün döyüşlərdə inamla iştirak ediblər. Faxralılar tarixin bütün dönəmində çətinliklərə sinə gəriblər.

Tarix ucu-bucağı görünməyən sonsuz bir ümmandır. "Unutmayaq ki, unudulmayaq" adlı kitabım da bu ümman içərisində bir damladır. Tarixin dərin qatlarına enmək, oradan bənzərsiz tarixi faktları üzə çıxartmaq tarixşünaslarımızın şərəfli vəzifəsi olmuşdur və yenə də olmaqdadır. Mən tarixçi və yazıçı deyiləm, mən vətəninə bağlı olan və hər an vətənin keşiyində layiqincə duran sadə bir hərbçi və iqtisadçıyam. Araşdırmalarımı da sənətimlə əlaqədar olaraq məhdud çərçivələrdə aparmışam. Belə ki, xarici dövlətlərə çıxa bilmədiyim üçün dərin sənədli araşdırma apara bilmədim. Belə ki, Gürcüstan, Rusiya, Türkiyə, İran və s. dövlətlərin arxivlərindən Faxralılar üçün müəyən sənədli dəlillər əldə etmək olardı. Buna görə də bu kitabı yazmamışdan öncə bütün tarixçilərdən və yazarlardan üzr istəyirəm və kitabın yazılışında hər hansı xətaya yol vermiş olaramsa buna görə məni bağışlamalarını təvəqqe edirəm. Çünki bu

kitab mənim daxili istirablarımın məhsuludur. Mən həmişə özlüyümdə istirab çəkirdim ki, görəsən dünyaya gələn, bu qədər ictimai fəallığı olan insanların adları nə üçün heç bir yerdə çəkilmir? Sualıma bu kitab vasitəsi ilə  cavab aldığıma görə artıq özümdə təsəlli tapıram.

“Unutmayaq ki, unudulmayaq” kitabıında eyni zamanda Faxralı kəndinin tarixi inkişaf mərhələləri şərh edilir. Faxralı xalçasının tədqiqi məsələsi, onun təsnifi məsələsi də bu kitabda öz əksini tapır.

Kitabın yazılmasının vaxtı çoxdan çatmışdır. Mən sevinc hissi ilə qeyd edirəm ki, bu şərəfli iş mənim üzərimə düşdü. Belə ki, Faxralı kəndinin tarixini qisməndə olsa araşdırmağa və faxralılar haqqında məlumatları toplamağa başladım. Bu uğurlu yolda, mənə bir çox tövsiyyələrini vermiş biologoya elimləri namizədi, dosent Sadıqov Əlövsət müəllimə öz təşəkkürümü bildirirəm. Nəsil şəcərələrinin yazılmasında mənə Əlövsət müəllim, İqaf dayı, Hüseyn dayı, Qabil dayı, Firdovsi həkim, Fərman dayı, Faiq dayı, İlham dayı, Mehman, Nürəddin dayı, Muraz və Məleykə müəllim köməklik etdikləri üçün onlara da öz təşəkkürümü bildirirəm və onların da bu kitabın ərsəyə gəlməsində rollarının olmasını fəxrlə qeyd edirəm. O cümlədən yaxın tarixlə bağlı yazıların ərsəyə gəlməsində rəhmətlik Həbib kişi və Cəlil (Ziyabil) kişinin yazıb qoyduqları qeydlərin və Şadılı kəndindən Cahangir müəllimin böyük köməyi oldu. Bəzi tarixi faktları Sanıyə (Bəylik) nənə və Hüseyn (Nəsifli) dayının danışıqlarına istinadən qeyd etmişəm. Xalçaçılıqla bağlı bilmədiyim məqamları Firduz xalanın sayəsində əldə edə bilmişəm. Faxralı ilə bağlı foto şəkillər Polad müəllim tərəfindən çəkilmişdir. Əlyazmaların kompyüterdə yazılmasında mənə köməklik etmiş Beyləqan rayonu Dünyamalılar kənd sakini, Bakı Dövlət Universtetinin Fizika fakultəsinin tələbəsi Lalə Mehman qızı Ağazadəyə və foto-şəkillərin fayllaşdırılmasında böyük köməyi olmuş İmişli rayonunun Bəhrəmtəpə qəsəbə sakini Fəqan Tahir oğlu Əliyevə, eləcə də adlarını çəkmədiyim və bu kitabın ərsəyə gəlməsində zəhməti olan hər bir şəxsə, etdikləri köməklərinə və çəkdikləri zəhmətlərinə görə öz təşəkkürümü bildirirəm.

Mən çox təəssüflə qeyd edirəm ki, əksər faxralılar bu kitabın ərsəyə gəlməsində biganəlik edərək özləri, ata-babaları, ana-nənələri və yaxınları barəsində heç bir məlumat vermədilər, beləliklə də bir çox faxralıların haqqında, o cümlədən Aydın müəllim, Tapdıq

müəllim, Tahir müəllim, hərbiçilərdən Mamed, Ələddin və s. kimi şəxslər, ələlxüsus kənarda yaşayan faxralılar barəsində, bu kitabda heç bir məlumat qeyd edə bilmədim. Buna görə məni qınamayın. İstərdim ki, kitabın növbəti nəşrlərində içtimai fəaliyyəti, təhsili və yaradıcılıq uğurları olan bütün faxralılar haqqında dolğun yazılar olsun. Bunun üçün məlumatların, yəni tərcümeyi-halın, şəklin və s. tarixi bilginin yazılı təqdim olunması gərəkdir.

Kitabın içərisindəki bölmələrdə səxslər haqqında yazılar Azərbaycan əlifbası sırası ardıcıllığı ilə tərtib olunub. Faxralı tarixi bölümünü mümkün qədər tarixi xronoloji ardıcılıqla qeyd etmişəm. Şəcərələr bölümündə nəsillərin şəcərələrini bildiyim qədər böyük övladdan kiçik övlada rəqləmlərlə qeyd etmişəm. Boşluqlar arası yazılan adlar qardaş-bacılar və onların övladlarıdır. Rum rəqəmləri ilə neçənci nəslə mənsub olduğunu qeyd etmişəm. Rəqəmlər vasitəsilə baba-nənələrimizin necə qohumluq əlaqələrinin olduğunu tapmaq üçün istifadə etmək olar. **Məsələn; Orucməmmədli nəsil şəcərəsində VIII.1.1.1.1.2.3.4.1.Fira övladları 1.Vüsal və 2.Azadə** burada **VIII** nəsil, birinci **1,** I nəslin birinci adamı, ikinci **1,** II nəslin birinci adamı, üçüncü **1,** III nəslin birinci adamı və s. bu kimi ardıcılıqla baxdıqda nəsildə kimin-kim ilə necə qohumluq əlaqəsini tapmaq olar. Bir də onu qeyd edim ki, eynilə başqa nəsillərdə də öz adına baxdıqda bu qaydaya uyğun olaraq qohumluq əlaqəsini tapmaq olar. Məsələn; **Xoylu nəslinin şəcərəsindən adımızı seçirik IV.1.1.1.4.Sərraf övladları 1.Vüsal və 2.Azadə.** buradan məlum olur ki, xoylu nəslindən Sərraf Orucməmmədli nəslindən Fira ilə evlənib. Nəsil şəcərəsində kimlərin adları yazılmayıbsa əvvəlcədən üzr istəyirəm və xahiş edirəm ki, yazılmayan adlar əlyazma ilə yazılsın və bu haqda mənə məlumat verilsin ki, növbəti nəşrlərdə biz bunları qeyd edək. Şəkillər bölümündə Faxralı kəndinin görüntüləri, "Faxralı" xalçası, "Faxralı" gəvəsi, faxralılar və faxralıların əl işləri verilmişdir. Poeziya bölümündə faxralıların yazdıqları şeirlərdən bir neçəsini qeyd etmişəm.

"Unutmayaq ki, unudulmayaq" kitabı yəqin ki, nöqsansız da deyildir. Kitabın nöqsanlarını nəzərimizə çatdıran oxuculara qabaqcadan öz minnətdarlığımı bildirirəm. Növbəti nəşrlərdə bu nöqsanların aradan qaldırılmasına çalışacağam.

# FAXRALI KƏNDİ

Faxralı kəndi Goranboy rayonunda kənd. Faxralı, Qurbanzadə kəndinin də daxil olduğu Faxralı kənd ərazi nümayəndəliyinin mərkəzi. Bakıdan 359 km, rayon mərkəzindən 32 km şimal-qərbdə, Gəncə-Qazax düzənliyindədir. Şimal-qərbdən rayonun Alpout, şimal-şərqdən Qurbanzadə, Şərqdən Yəhərçi Qazaxlar, cənub-şərqdən Sarov, cənubdan Quşcular, cənub-qərbdən Ağamalıoğlu, qərbdən Alpout kəndləri ilə həmsərhəddir. Sahəsi 1367 ha, əhalisi 2700 nəfər olmaqla 700 təsərrüfatı və 540 tikili evi var. Əhali pambıqçılıq, taxılçılıq və heyvandarlıq ilə məşğuldur.




**Şəkil 1. Faxralı kəndinin ərazi xəritəsi**

Faxralı kənd əhalisinə bölünən torpaq 1000 ha, bələdiyənin mülküyəti 272,5 ha, ( o cümlədən 16,85 ha, perspektif inkişaf fondu 21 ha, bələdiyyə örüş torpaq 60 ha, ümumi istifadə torpağı 119 ha, sair torpaq 56 ha, kəndaltı torpaq 87,5 ha-dır. Kənddə orta məktəb, uşaq bağçası, klub, kitabxana, tibb məntəqəsi, ATS, poçt və ictimai

binalar vardır. Eyni zamanda kənddə dəyirman, şadlıq sarayı, bir neçə mağaza və çayxana fəaliyyət göstərir.

Kəndin adını şəxs adları ilə, yəni Fağır Alı, Fəxr Əli ilə bağlayırlar. Nəzərə alsaq ki, tarixən məkan və yer adlarını igidlərin, ərənlərin, qoçaqların, bəylərin və xanların adları ilə bağlayırlar, deməli fağır adamın adına toponim ola bilməz. Tarixdə Faxralı kəndinin sakinləri İslam dininin Sünnü məzhəbinə etiqad ediblər. Bu halda Fəxr Alı və Fəxr Əli kimi adların bu kəndin adına qoyulması mümkünsüzlüyü ortaya çıxmış olur. Faxralı sözünün etimologiyası mənim etimal etdiyim qədim Odərələrin Ağüz ərazisində şuma gedənlərinə deyilən Fərağlı sözündən götrülmüşdür. Çünki günümüzdə də qocalardan eşitdiyimiz Faxra nənəm, Faxra anam, Faxra nənənin göy qurşağı, Faxra ananın şumu və s. kimi ifadələr işlədilib.



**Şəkil 2. Faxralı kəndində tapılan qədim daş kəsici alət**



**Şəkil 3. Faxralı kəndində tapılan küp qırıqları**

Yağışdan sonra müşahidə edilən göy qurşağını faxralılar ziyarətə çıxardılar ki, Faxra nənə qurşağını açıb, sallayıb. Bahar vaxtı, yaz əkinlərinə başlamazdan əvvəl Faxralılar şuma getməmişdən öncə Faxra ananın adına qazanlar asarmışlar və səmənilərlə xonçalar bəzədilərək şuma aparılarmış. Bununla da onlar Faxra anadan ruzinin bol olmasını istəyirlərmiş. O, dövrlər vətənə "Anam", şum torpaqlarına "Eyəranam", şum torpaqlarında əkinlə məşğul olan Fərodlara "Ağəranam" deyirmişlər. "Ağər", "Eyər" Bağ işığı mənasındadı. Odərlər Allaha Bağ deyirmişlər, hansı ki, ruslar indi Boq deyirlər. Fərod sözü "Fər" həm güclü işıq, həm də saf insan, "Od" həm od, həm də həqiqət mənalarının birləşməsidir. Deməli Fərağ sözü Allahın işığı, saf insan işığı anlamlarına gəlir. Ehtimal ki, Fərağlı sözü Fəhralı, Fəxralı və Faxralı kimi günümüzə gəlib çıxıb. Bəzi mənbələrdə isə Faraqlu kimi qeydiyata alınıb. Mənim Faxralı etima-



**Şəkil 4. Faxralı kəndinin müxtəlif yerlərindən tapılmış qədim əşyaların qırıqları**

logiyası haqda digər ehtimalım belədir ki, Gəncəbasarda "Fəxri xəli"lər adlanan, astronomik və həndəsi quruluşlarda toxunmuş xəlilər olub. Nəzərə alsaq ki, bizim "Faxralı" xalçaları da astronomik və həndəsi fiqurlarla bəzədilərək toxunub, o zaman Faxralı sözünün "Fəxri xəli" sözündən də yaranması ehtimal edilə bilər.

Aparılan kompleks elmi tədqiqatlar zamanı müəyyən edilmişdir ki, insanların həyatında təbii-coğrafi şəraitin mühüm əhəmiyyəti olmuşdur. Alimlər müəyyən etmişlər ki, insanların və insan cəmiyyətinin formalaşması və ayrı-ayrı inkişaf mərhələləri təbii coğrafi şəraitin inkişafı ilə yanaşı qarşılıqlı əlaqədə getmişdir. Aparılan elmi araşdırmalar zamanı məlum olmuşdur ki, harada əlverişli təbii-coğrafi şərait olmuşsa, məhz insanlar həmin ərazilərdə məskunlaşmışlar. Qışı quraq keçən mülayim iqlim, səhra və quru çöl iqliminə malik Faxralı kəndi dağlardan gələn sel sularından qorunmaq üçün cox əlverişli bir hündürlükdə yerləşmişdir. Burada qarlı günlərin sayı az olduğundan və həmin müddətdə qarın qalınlığı 10 santimetrdən artıq olmadığından bu ərazilər yüksək məhsuldarlığa malik olan qış otlaqları ilə zəngin olub. Yağıntıların az olması ilə əlaqədar ilin soyuq yarısı torpaq sulu, isti yarısı isə quraqlıq olub.

 

**Şəkil 5. Axçabəy çayının yaxınlığında kəhriz quyusu üzərində açılan dəliklər**

Yağıntıların az olması ilə əlaqədar ilin soyuq yarısı torpaq sulu, isti yarısı isə quraqlıq olub. Bu da qismən quraq iqlimə malik olan Faxralı torpaqlarında suvarma əkinçiliyi üçün ciddi maneələr törədib. Buna görə də tarixən Faxralılar ən intensiv əkinçiliklə məşğul olmaq üçün Kürəkçay çayı nahiyyəsindəki torpaqlarda məhsul becərmək işləri ilə yanaşı, kəhrizlər vasıtəsi ilə də suvarma işləri aparıblar. Belə ki, hazırda da həmin kəhrizlərin qalıqları “Qara su” deyilən istiqamətdə, kəndin mərkəzi yolunun üstündə və “Axçabəy” arxı istiqamətində özünü biruzə verməkdədir.

1961-1962-ci illərdə Faxralı kəndində, “Əyri arx” deyilən yerdə təxminən indi Şəmilbəyin yaşadığı, keçmişdə isə Ələstangil olan ərazidə küp qəbir aşkar edilmişdir. Tədqiqat aparılması üçün həmin küp qəbir haqqında Azərbaycan Milli Elmlər Akademiyasının Tarix institutuna məlumat verilmişdir. Nəzərə alsaq ki, küp qəbirlər dövrü qədim eneolit dövrünə (b.e.ə.VI-IV minillik) təsadüf edir, demək Faxralı kəndinin qədim yaşayış yeri kimi mövcud olması ehtimalı daha da artmış olur. Eyni zamanda Faxralı kəndi ərazisində olan Qaramanlı yeri kimi tanınan ərazidə də traktorçular şumlama işi ilə məşğul olduqları vaxt küp qəbirləri və saxsı qab qalıqları yer səthinə çıxmışdır. Sahilgil yaşayan indiki ərazidə, Axçabəy arxının qərb tərəfində tarixi təxminən 700-800 il bundan əvvələ təsadüf edilən qəbiristanlıq mövcud olmuşdur. Təəssüflə qeyd edim ki, bu ərazilərdə arxeoloji qazıntılar aparılmaması ucbatından tarixin bu səhvələri hələ də qaranlıqda qalmaqdadır.



**Şəkil 6. Xalçaçılıqda istifadə olunan cəhrə**



**Şəkil 7. Yun daramaq üçün daraq**

Azərbaycan xalqtətbiqi sənəti və onun bir qolu olan xalçaçılıqda və eləcədə xalqın milli mədəniyyəti tarixində "Faxralı" xalçası özünəməxsus yer tutur. Azərbaycan xalqının məişətində özünə möhkəm yer tutmuş və az qala xalqın rəmzinə çevrilmiş xalçaçılıq xalq sənətinin ən geniş yayılmış növüdür.

"Faxralı" xalçası faxralıların həqiqətən də bütün dünyada rəmzidir. "Faxralı" xalçası və gəvəsi müxtəlif astronomik, həndəsi və Orxon Yenisey yazıları ilə, naxış elementləri və təsvirlərlə bəzədilən xovlu və xovsuz xalçalar dəyələrin, çadırların, alaçıqların, habelə yaşayış evlərinin və digər binaların divar bəzəklərində, döşəmələrində istifadə edilir, eyni zamanda yüksək estetik əhəmiyyət kəsb edir. Arxeoloji materiallara və yazılı mənbələrə əsasən Azərbaycanda Gəncə və Gəncəbasarda xalçaçılıqla hələ Tunc dövründən (e.ə. II minilliyin sonu I minilliyin əvvəllərində) məşğul olmuşlar. Cənubi Azərbaycanın Maku şəhərindən tapılmış gildən düzəldilmiş at fiqurunun (e.ə. II minillik) üzərində gül-çiçək təsvirləri ilə bəzədilmiş çul (çul qədimdə atların və digər heyvanların üzərlərinə salınırmış) rəsmi, Urmiya gölü yaxınlığındakı Həsənli təpəsindən aşkar edilmiş qızıl camın (e. ə. I minillik) səthində, üstünə çul salınmış şir təsviri və başqa tapıntılar Azərbaycanda xalçaçılıq sənətinin nə qədər qədim tarixə malik olduğunu göstərir.



**Şəkil 8. Goranboy rayonunun Faxralı kəndinin gəvəsi**

Arxeoloji qazıntılar zamanı Mingəçevirdən I-III əsrlərə aid katakomba qəbrlərdə palaz və xalça qalıqları aşkar edilmişdir. Azərbaycanda xalçaçılığın inkişafı haqqında Herodot, Klavdi Elian, Ksenofont və başqa qədim dünya tarixçiləri məlumat vermişlər. Gəncə xalçaçılıq məktəbi  Gəncə şəhəri və onun ətraf kəndlərini o cümlədən Faxralı kəndini də əhatə edib. Bu məktəbin mərkəzi Gəncə şəhəridir. Gəncə xalçaçılıq məktəbi Gəncə ətrafında olan rayonların xalçaçılığına müsbət təsir göstərmişdir. Gəncə hələ X-XI yüzilliklərdə ipək, yun parçaların, ipək xalçalarının istehsal mərkəzi kimi tanınmışdır. Əsrlər boyu yüksək keyfiyyətli xalça istehsalı olan Faxralıda bir çox evlərdə xüsusi xalça emalatxanaları mövcud olmuşdur.



**Şəkil 9. Goranboy rayonunun Faxralı kəndinin namazlıq xalçası**

Gəncə qrupuna daxil olan "Faxralı" namazlıq xalçası öz yüksək bədii xüsusiyyətinə, toxunuşuna görə digər xalça kompozisiyalarından fərqlənir. Keçmişdə Faxralı əhalisi heyvandarlıqla məşğul olduğundan bu kəndin qadınları xalça toxumaqla məşğul olublar. Faxralı qadınlarının gözəl əl işi olan xalçalar bizim qədimliyimizin sübutu üçün ən gözəl təminatçıdır. Mədəniyyətimizin bu gözəl incisi

keçmişimizi bu günümüzə qədər aça bilmədiyimiz gizli şifrlərlə bizlərə daşımaqdadır. Olduqca böyük şərtiliyə əsaslanan “Faxralı” xalçasında, əsasən naxışların həndəsi üslubuna daha çox üstünlük verilir. Bu naxışlar kainatın sirlərini, mistik təsəvvürləri, insanın anadan olandan qəbirə qədər həyat tərzini damğalar və cizgilərin dili ilə bizlərə açıqlayır. Belə ki, Faxralı xəlisi üzərində yelən, alamuncuq, xonça, güzgü, çıraq, farmaş, aşıq, göbək, alma, beşik, əyri, çomaq, iç qıvrım, çöl qıvrım, içlik, kəsmələr, it izi, əl, caynaq, qiblə, qəbir və s. kimi günümüzə gəlib çatan, amma adları məlum olmayan naxışlar vardır. Faxralı xalçasının toxunuşunda yüksək keyfiyyətli qoyun yunlarından istifadə edilmişdir. Burada istifadə edilən bütün rənglər Allahın təbiətə, təbiətin isə bizlərə bəxş etdikləri köklərdən, çiçəklərdən, yarpaqlardan, giləmeyvələrdən, tərəvəzlərdən və Ana Təbiətin başqa mənbələrindən alınan boyalardan hazırlanmışdır. Ən maraqlısı odur ki, Faxralı xalçasının rənglərinin solmaması üçün, rənglənmiş sapları qaramal sidiyində bir neçə gün saxlayırlarmış və bundan sonra rəng heç vaxt öz təravətini itirmirmiş. Hər xalçanın yaradılması insanları keçmişə daşıdığı kimi, Faxralı xalçası da bizləri öz keçmişimizlə sıx bağlayır.

Qeyd etmək yerinə düşər ki, 1949-cu ilin martında İ.V.Stalinin 70 illik yubileyinə göndərilən ən qiymətli hədiyyələr içərisində Faxralı sakini Mahya nənənin toxuduğu xalçada var idi. "Faxralı" xalçası hal-hazırda dünyanın bir neçə müzeyində, o cümlədən Azərbaycan xalçası və xalq tətbiqi sənəti Dövlət Muzeyində (1344/1926-cı il. Yun, əl işi. 193x170 sm. sıxlığı 50x50), Londonun Viktoriya və Albert, Sankt-Peterburqun Ermitaj müzeylərində vardır.

Gəncə şəhəri iqtisadi baxımdan inkişaf etdiyi dövrlərdə faxralılar dulusçuluqla, dəmirçiliklə də məşğul olublar. Çünki bunun üçün Faxralı ərazisində münbit şərait var. Sarı təpə kimi tanınan Faxralı ərazində gildən hazırlanmış saxsı qabların qırıntıları bu günümüzdə də mövcuddur. Deyilənlərə görə Sarı təpədə qazılmış hər iki tərəfi açıq qazmalar mövcud olub, bu da onu göstərir ki, dulusçular hazırladıqları qabları bu qazmalarda qurudurmuşlar. Buradan sarı torpaq aparmaq məqsədi ilə qazıntı aparanlar ocaq yerlərinin olması haqqında da söyləyiblər. O cümlədən BTC (Bakı Tiblisi Ceyhan) boru kəmərinin çəkilişi zamanı AMEA (Azərbaycan Milli Elimlər Akademiyası) və BTC-nin arxeloqları tərəfindən aparılan qazıntılar zamanı, kəmərin Faxralı kəndi ərazisindən keçən KG 289 sahəsində

orta əsrlərə aid yaşayış məntəqəsinin olduğu məlum olub. Belə ki, qazıntılar zamanı təndir yerləri, ocaq yerləri və saxsı qab qırıntıları tapılıb. Həmin ərazidə də arxeloji araşdırıma aparmağa ehtiyac var. (mənbə: BTC boru kəmərinin milli QHT-lar (Qeyri Hökümət Təşkilatı) tərəfindən monitorinqi, tarixi, mədəni və arxeoloji abidələrin qorunması üzrə işçi qurupun yekun hesabatı).



**Şəkil 10. Faxralı kəndidə qazıntılar zamanı tapılmış müxtəlif məişət əşyalarının qırıqları**

Bəziləri kəndin əsasının XVII əsrin ortalarında Gürcüstanın Faxralı kəndindən, digərləri isə Qazaxın Faxralı kəndindən gələnlər tərəfindən qoyulduğunu söyləyirlər. Belə güman edilir ki, Faxralı əhalisi Borçalı–Qazax elləri üsyana qalxdıqları zaman dağıdılmış üsyandan sonra indiki ərazidə məskunlaşıblar. Çünki bəzi mənbələrdə yazılanlara istinadən 1773-ci ildə Gürcüstan Rusyanın tabeliyinə qəbul edilib, rus qoşunu buraya gələndən sonra borçalılardan bir çoxları qərib yerlərə köçürlər. 1778-ci ildə Gürcü çarı İrakli mülkədar Şioş Soloğaşvili Arğutaşviliyə vəkalətnamə ilə

tapşırdı: “Faxralı eli Gürcüstandakı yurdlarından Gəncəyə gedib, xeyli vaxtdır orada sakin olub. Hər cür yolla Gəncədən Faxralı elini Gürcüstan torpağına gətirməyə çalışın, ”(Mənbə: Shureddin. azersayt. com). 1765-ci ildə Borçalı elində mouravlıq (murovluq) idarə üsulu tətbiq edildi. Murov camaatdan vergi yığımına göz qoyur, Gürcü şahının yerdə yetkili elçisi olur, xırda divan işlərinə də baxırdı; Qaynaqlara görə  Faxralıda Şioş Arğutaşvili murov idi. 1804-cü ilə aid sənəddə Faraqlu adlı yaşayış məntəqəsi haqda məlumat verilmişdir. Mənbədə eyni adlı 4 toponim göstərilmişdir. Eyni adlı kənd Şəkidə, Lacinda və İranda da qeydə alınmışdır. Ancaq bu deyilənlərə aydınlıq gətirərəkmək üçün aparılan araşdırmaların nəticəsində məlum oldu ki, hələ Gəncə-Qarabağ əyalətinin 1727-ci il tarixli müfəssəl dəftərində Gəncə qəzasının Böyük Kürəkbasan nahiyəsində faxralılar vergi ödəyicisi kimi qeydə alınıblar. Adı çəkilən sənəddə faxralıların qışlaq yerləri Ağcabəy, Səradan və Hezarəhmədli kəndləri, yaylaqları isə Şüturbad nahiyyəsində göstərilmişdir. Həmin müfəssəl dəftərdən çıxarışı olduğu kimi qeyd edirəm:

“**Kürəkbasan nahiyəsi Səh.130.**

Kürəkbasana tabe olan Ağcabəy kəndi. Kənd Ağcabəy cayının kənarında yerləşir.

Kürəkbasana tabe olan Badik məzrəəsi. Başqa adı Ələkil olan bu məzrə Ağcabəy kəndinin yaxınlığında yerləşir. Bu məzrənin (Ağcabəy) kəndinin rəiyyətləri və Faxralı camaatı əkib-becərir.

Kürəkbasana tabe olan Ələşgird məzrəəsi. Bu məzrə Ağcabəy kəndinin yaxınlığında yerləşir.

**Səh.133.**

Kürəkbasana tabe olan Səracan kəndi. Başqa adı Əyərçi olan bu kənd Sirac çayının kənarında yerləşir.

**Səh.134.**

Kürəkbasana tabe olan Hezarəhməd kəndi. Kənd Hezarəhməd çayının kənarında yerləşir.

**Səh.135.**

Faxralı camaatından Abdulla, İbrahim İnal oğlu, Yusif Hüseyn oğlu.

**Səh 145-146.**

Kürəkbasana tabe olan Hacı Əlili camaatı. Bunlar da Böyük Kürəkbasan nahiyəsində Sorluq Cəyirli kəndində qışlayır,

Şəmkürbasanda yaylayırlar. Hacı Əlili camaatından əldə edilən gəlirə, Faxralıdan əldə edilən gəlir də əlavə edilirmiş. Üşr və behrə gəlirlərini torpaq sahiblərinə verirmişlər. Dəftər hazırlandıqdan sonra Şirvan torpaqlarına köçüb getmişdilər.

**Səh 154.**

Böyük Kürəkbasana tabe olan Faxralı camaatı. Bu camaat Kürəkbasan nahiyəsinə tabe olan Ağcabəy kəndi, Səradan (?), Hezarəhməd və başqa kəndlərdə pərakəndə halda qışlayır, Şüturabad nahəyəsində yaylayırlar. Üşr vergisini Kürəkbasanda olan sultan xasslarının işlərini idarə edən şəxsə (sərgar) verirlər.

Vəli Cəbrayıl oğlu, (Vəlinin) qardaşı Günüəhməd, Əli Vəli oğlu, Hacı Yusif Məhəmməd oğlu, (Hacı Yusifin) qardaşı Niyazalı, (Niyazalının) oğlu Abdulla, Məhəmməd Dostəli oğlu, (Məhəmmədin) qardaşı Molla Vəli, (Molla Vəlinin) oğlu Dostəli, Şərif Şəfi oğlu, (Şərifin) qardaşı Nəbi, (Nəbinin) qardaşı Şəfi.

Məhəmməd İbrahim oğlu, (Məhəmmədin) qardaşı Molla Vəli, (Molla Vəlinin) oğlu İbrahim, Şeyxnəbi Vəli oğlu, (Şeyxnəbinin) oğlu Əli, Məhəmməd Nəbi oğlu.

(Məhəmmədin) qardaşı Sultan, Vəli Mustafa oğlu (Vəlinin) oğlu Vəli, Xanəhməd Qəzənfər (?) oğlu, (Xanəhmədin) qardaşı Əbdulqasım, (Əbdülqasımaın) oğlu Mirqasım.

Qırzəli Seyid oğlu, (Qırzəlinin) qardaşı Mehrəli, Sahib Səfər oğlu, (Sahibin) qardaşı Molla İbrahim, (Molla İbrahimin) oğlu Səfər, (Səfərin) oğlu Qasım,

(Qasımın) qardaşı İsrafil, Pirəli Pirəli oğlu, (Pirəlinin) oğlu Nəbi, Vəli Pirverdi oğlu, (Vəlinin) qardaşı Əli, Pirimverdi Vəli oğlu.

(Süleyman) Vəli oğlu, (Süleymanın) oğlu İbrahimxəlil, Comərd (?) Məhəmməd oğlu, (Comərdin) oğlu Məhəmmədəli, Pirqasım Məhəmmədəli oğlu, Qasım Əli oğlu.

Məhəmməd Əhməd oğlu, (Məhəmmədin) qardaşı Əli, İbrahim Məhəmməd oğlu, Əmin Hüseyndan oğlu, (Əminin) oğlu Hüseyndan, (Hüseyndanın) oğlu İbrahimxəlil.

Qasım Əli oğlu, (Qasımın) oğlu Qurban, Nəzərqulu Bican (?) oğlu, Məhəmməd Bican oğlu, Tanrıqulu Adı oğlu (Tanrıqulunun) oğlu Adıalxan.

Günü Murad oğlu, Məhəmmədəli Murad oğlu, Əhməd Əli oğlu, (Əhmədin) oğlu Yusif, Hacı Mustafa İbrahimxəlil oğlu, Əmirxan Qayırxan (?) oğlu.

(Əmirxanın) qardaşı Kazım, Sultanməhəmməd Mehdi oğlu, (Sultanməhəmmədin) qardaşı Qurban, Məhəmməd Sultan oğlu, Molla Nəbi Hacı Zeynal oğlu, (Molla Nəbinin) qardaçı Abdulla.

Piri Nəbi oğlu, Musa Əmin oğlu, (Musanın) qardaşı Pirverdi, İsmayıl Məlik oğlu, (İsmayılın) qardaşı Vəli, Vəli Niyaz oğlu. (Vəlinin) qardaşı Hacı, Vəli İbrahimxəlil oğlu, Molla Məhəmmədşah oğlu, (Mollanın) qardaşı Qədiməli, Yaqub Əli oğlu, (Yaqubun) qardaşı Süleyman.

**Səh.155.**

Rza Şahverdi oğlu, (Rzanın) qardaşı Mustafa, Əhməd Sadıq oğlu, (Əhmədin) oğlu Əhməd, (Əhmədin) oğlu Qasım, (Qasımın) oğlu Əli.

Möhsüm Bayramqulu oğlu, (Möhsümün) qardaşı Məhəmməd, Tanrıqulu Əbülxan oğlu, (Tanrıqulunun) oğlu Adıalxan, (Adıalxanın) oğlu Dilənçi, Əli Əli oğlu. (Əlinin) qardaşı Əliməhəmməd, İbrahimxəlil Cəbi oğlu, Əli Xəlil oğlu, Molla Qoca Qasım oğlu, (Molla Qasımın) qardaşı Əli, Qurban Qambi (?) oğlu. (Qurbanın) qardaşı Məhəmmədağa, Məhəmməd Sübhi oğlu, (Məhəmmədin) qardaşı Hacıməhəmməd, İbrahim Xəlil oğlu, Yarəhməd Vəli oğlu, (Yarəhmədin) oğlu Qara.

İsmayıl İbrahimxəlil oğlu, (İsmayılın) qardaşı Məsum,Yusif Əli oğlu, (Yusifin) qardaşı Nəsif, İbrahım Qoçu oğlu, (İbrahimin) qardaşı Zülfüqar.

Şeyxməhəmməd Ucan (?) oğlu, (Şeyxməhəmmədin) oğlu Nuru, Mahmud Teymur oğlu, (Mahmud) oğlu Cəbrayıl, (Cəbrayıl) qardaşı Mustafa, Qaraqulu Murtuza oğlu.

(Qaraqulunun) qardaşı Cəbrayıl, Seyid Xəlil oğlu, (Seyidin) oğlu Əli, (Əlinin) oğlu Fəzail, (Fəzailin) oğlu Şeyxhəsən, Nuru Rza oğlu.

(Nurunun) qardaşı Vəli, Ağa Mustafa oğlu, (Ağanın) qardaşı Mustafa, Rəcəb Şahverdi oğlu, Əhməd Sadıq oğlu, Nəsib İbrahimoğlu.

Mustafa Sübhəddin İsmayıl oğlu, (Sübhəddinin) oğlu İsmayıl, Xanəhməd Həsən oğlu, (Xanəhmədin) qardaşı Əli, Mahmud Məlik oğlu.

(Mahmudun) qardaşı Maqsud, Vəli Əli oğlu, Ərşməhəmməd (?) Mahmud oğlu, Əvəzəli Məhəd oğlu, Əli  Nuru oğlu, (Əlinin) qardaşı Kamran.

(Kamranın) qardaşı Məhəmmədəli, Zaman Novruz oğlu, (Zamanın) qardaşı Əli, (Əlinin) qardaşı Novruz (?), Əhməd Məhəmmədəli oğlu, (Əhmədin) oğlu Əli.

Yusif Çıraq oğlu, Abdulla, * Əli,* Yolum Əli oğlu, Günü, *Mustafa.*

Məhəmməd Hacı Məhəmməd oğlu, (Məhəmmədin) oğlu Pirəli, Vəli Mustafa oğlu, Şərif Şəfi oğlu, Əli Yusif oğlu, Möhsüm İbrahim oğlu.

Süleyman Nəbi oğlu, Qasım İsmayıl oğlu.

**Gəlir:**

Beindi və subay vergisi-18.720 ağca

Qoyun vergisi- 9.000 ağca

Kərə yağı vergisi- 4.580 ağca.

Cift vergisi

Gəlinlik vergisi-300 ağca

Qısraq vergisi- 2.000 ağca

Qışlaq vergisi- 1.200 ağca

Yataq vergisi- 1.600 ağca.

Badi-hava, işlənmiş günah, törədilmiş cinayət üçün- 1.200 ağca

**Yekun 38.700 ağca**."

Goranboy rayonunun Faxralı kəndi qədim yaşayış ərazilərindən olduğundan faxralılar heç bir yerdən gəlmə deyillər, əksinə şah İsmayılın yürüşləri zamanı ərazilərdə gedən çoxsaylı müharibə və münaqişələrdən təngə gələn faxralılar, bu kimi çirkinliklərdən uzaqlaşmaq məqsədilə yaşadıqları yerlərindən didərgin düşüblər. Bundan sonra bu camaat Kürəkbasan nahiyəsinə tabe olan Ağcabəy kəndi, Səradan, Hezarəhməd və başqa kəndlərdə pərakəndə halda qışlayıb, Şüturabad nahiyəsində yaylayıblar. O cümlədən Faxralıdan Borçalı Faxralısına, Yevlağın Tanrıqulular kəndinə, Hürüuşağı kəndinə, Şəkinin Xanabad kəndinə səpələnmişlər və ətraf ərazilərdə məskunlaşmağa başlamışlar. Hətta faxralılar ərazidə gedən çoxsaylı müharibələrdən bezərək lap uzaqlara getmiş Türküyənin indiki Yozqat vilayətinin Cayralan ərazisində Fahrali kəndini salmışlar. Faxralıların Qarabağ ərazisndə, Murov dağının cənub qərb ətəklərində Kəlbəcər, Laçın dağlarında, Nağarada, Xaşbulaqda yaylaqları olub və indiyədək də orada Faxralı toponimi mövcuddur. Həmin dövrlərdə yaylaqlarda olan faxralılar orada məskunlaşmaq məcburiyyətində qalıblar. Faxralıların həmin ərazilərdə məskunlaşma

dövrü ilə şah İsmayılın yürüş tarixlərinin üst-üstə düşməsi özü də buna əyani sübut ola bilər. Həmcinin yuxarıda qeyd etdiyim müfəssəl dəftərdən də göründüyü kimi faxralılar dağınıq halda yaşaması, onların bir yerdən, yəni indiki Goranboy rayonunun Faxralı kəndindən yayılmasına əsas ola bilər.

Faxralılar heyvandarlıqla məşğul olduqlarından Korçay çayı boyunca qışlaqlarda binələr salıblarmış. Faxralı elinin Qarabağ ərazisndə, Murov dağının cənub qərb ətəklərində, Kəlbəcərin Bağırxan yaylaqlarında, Laçın dağlarında, Nağarada, Xaşbulaqda yaylaqları, Bozdağda və Samux ərazisində qışlaqları olmuşdur. Keçmişdə indiki Qurbanzadə kəndinin yaxınlığında Qırmızı Qazaxlar kəndi mövcud olub ki, kəndin də yaxınlığında qəbristanlıq yerləşib. Həmin qəbristanlıqda Faxralı sakinləri indi də dəfn olunurlar. Nəzərə alsaq ki, tarixən qəbristanlığın salındığı yerlər yol kənarları və yaşayış yerlərinin girəcəkləri olub, deməli həmin ərazidən Gəncə şəhərinə və ya qışlaq sahələrindən yaylaqlara hər hansısa bir yol gedib. Araşdırma zamanı oda məlum oldu ki, Şəkidən və Mingəçevirdən Gəncəyə Kərpicli deyilən yerdən Ahar-Bahar təpəsinin (deyilənlərə görə Ahar-Bahar təpəsindən yolun həm şimal həm də cənub istiqamətləri aydın görünür) yanından əsas yol olub, hansı ki, Kür çayını bərələr vasitəsi ilə keçib şimal ərazilərdən cənub ərazilərinə və əksinə gedirmişlər. Faxralılar isə bu yolun üzərində yerləşib. Deyilənlərə görə indiki Faxralı kəndi Şadlı ilə Qaradağlı kəndləri arsında məskunlaşıbmış. Amma araşdırmalarım nəticəsində məlum olan o oldu ki, faxralıların və Şadlı ağsaqqalı olan, şair kimi tanınan Gahangir kişinin dedikləri də bunu təsdiqlədi ki, Qaradağlı və Şadlı kəndləri arasında Faxralı yurdu olub. Bu ərazilərdə faxralılar Kürəkçay nahiyyəsində əkinçiliklə məşğul olublar və hətta burada faxralıların dəyirmanı da olub. Xoylu kəndindən olan ağsaqqal, tarixci Süleyman müəllim də Cahangir müəllimin dediklərini təsdiq etdi. Ancaq Cahangir müəllim və Süleyman müəllim Faxralı əhalisinin Kürəkçay nahiyyəsinin Çaylı kəndi istiqamətində də əkinçiliklə məşğul olma və dağdan arana köç edərkən duracaqları yerlərin mövcudluğunu babalarından eşitdiklərini deyirlər. Cahangir müəllim Faxralı kəndinin 1139-cu ildə Gəncədə baş vermiş zəlzələdən də qabaq yarandığını babalarından eşitdiyini söyləyir. (Cahangir müəllimin özünün də Faxralı kəndində Qulular və Qocalar nəsli ilə qohumluq əlaqələri var.

Gahangir müəllim həm də Faxralı kəndində 7 illik məktəbdə təhsil alıb).

Deyilənlərə görə indiki "Bəylik" adlanan nəsildən olan Ağcabəy tayfa davası nəticəsində həmin ərazilərdən indiki yerləşdiyi əraziyə köçüb və məskunlaşıb. Ağsaqqalların dediyinə görə Ağcabəy indiki Samux rayonunun Sərkər kəndindən olub. Əraziləri Kürəkçay çayının nahiyyəsi Çaylı kəndi tərəfdən, Dozular kəndi və Yolqulular kəndinin yerləşdiyi yerlər olub. Çoxlu heyvan sürüləri olub. Ağcabəyin qardaşı Faxralı kəndindən bəylik nəsli kimi tanınan nəsildən qız alıb və Faxralı kəndində məskunlaşıb. Çox güman ki, hansısa tayfa davasından sonra Ağcabəy qardaşının yanına gəlib və Faxralıda məskunlaşıb.

Şadlı, Qaradağlı kəndləri arasındakı Kürəkçay çayı nahiyyəsindəki sahələrə Şirinbəy yeri deyilməkdədir. Belə bir yerin Faxralı kəndi ərazisində də olduğu üçün, yəni Şirinbəy yerinin uzlaşmasını bilmək üçün Şadlı kəndindən olan ağsaqqal Cahangir müəllimə müraciət etdim. Onun dediklərinə görə Şadlı kəndində olan ərazi Şirinbəyin yox Kərbəlayı Musa bəyin ərazisi olub. Şirinbəy özü isə kənd Zazalıdandır. O, Kərbəlayı Musa bəyin qızı Tellini alıb. Sonra Musa kişidən atları üçün otlaq sahəsi istəyib və Musa bəy də indiki Şirinbəy yeri kimi tanınan ərazini kürəkəninə verib. Təxminən 1870-ci illərdə Şirinbəy fürsətdən istifadə edərək Kərbəlayı Musanın ərazilərini xəritəyə saldırır, Çar höküməti tərəfindən sənədləşdirərək öz adına keçməsi üçün Musa bəyi aldadaraq ona barmaq basdırıb. Bu minvalla Kərbəlayı Musa bəyin torpaqlarını ələ keçirib. Ancaq Faxralı kəndində olan Şirinbəy yeri elə Faxralılı Şirinbəyin yeridir. Faxralılı Şirinbəy Çar hökumətinə tabe olmayıb. Həmçinin qardaşları İsmayıl bəy və Hüseyn ağa Çar hökümətinə tabeçilik göstərməyiblər. Onlar Güləhməd bəyin övladları olublar. Sonralar Məşədiəlilərdən Həsən, Hüseyn ağanın oğlu Behbudu öldürür. Həmin vaxt Şirin bəy, İsmayıl bəy və Hüseyn bəy Məşədiəliləri öldürmək istədikdə onlar Mollavazlı kəndinə qaçıb bir müddət gizlənirlər. Həsənin Mollavazlı kəndindən Gəncəyə gedəcəyindən xəbər tutan qardaşlar Gəncə yolunun üstündə Həsəni tutub başını kəsib qanını saqqallarına cəkirlər, çünki Həsən Hüseyn ağanın oğlunu öldürəndən sonra saqqalına həna qoyub gəzirmiş. Həsənin ölümündən sonra qardaşlar onun üçün Quran oxuyublar. Bu hadisəyə görə Çar höküməti Şirin bəyi və İsmayıl bəyi həbs edərək Sibirə sürgün ediblər. 6 aydan sonra

sürgündən qaçan Şirin bəy və İsmayıl bəy Çar hökümətinə qarşı mübarizə aparıblar. Çox təəssüflər olsun ki, Dəli Alının vasitəsilə yerləri təyin edilərək qardaşlar güllələniblər. Dəfn edildikləri yer Faxralı qəbiristanlığı olub. Sürgündən qaçdıqdan sonra qardaşlar Samux bəyləri tərəfindən qorunurlarmış və öldürüldükdən sonra da onların sayəsində ata yurdlarında dəfn ediliblər.

Kürəkçay çayından şimala doğru ayrılan arxa bugünə qədər də Ağcabəy arxı deyilməkdədir. Hal-hazırda Korçay çayı nahiyyəsində də Şirinbəy yeri, Nəsifli suvadı kimi tanınan yerlər mövcuddur. (Şirinbəy bəylik nəslindən olub. Sonralar qaçaq olub).

Faxralı kənd sakinləri təsərrüfatın bütün sahələrində öz bacarıqlarını yüksək göstəricilər vasitəsi ilə daim göstəriblər. 1890-cı ildə Faxralı kənd sakinləri baramaçılıq sahəsində yüksək gəlir əldə ediblər. Belə ki, həmin ildə 1 ton barama təhvil verilib. O cümlədən faxralılar XX əsrin əvvələrində yüksək üzüm məhsulu yetişdirərək bu sahədə də yüksək nailiyyətlər əldə ediblər. 1960-1980-ci illərdə Faxralı kəndi bütün təsərrüfat sahələrində yüksək və keyfiyyətli məhsuldarlığa görə demək olar ki, hər il təltiflərə və diplomlara layiq görülüb. Faxralı kəndi 1975-cı ildə pambıqçılıq sahəsi üzrə yüksək göstəriciliyə görə Azərbaycan Respublikası Kommunist Partiyası Mərkəzi Komitəsinin, Azərbaycan Respublikası Nazirlər Sovetinin və Azərbaycan Respublikası Həmkarlar İttifaqının "Keçici Qırmızı Bayrağı" və "Fəxri Fərman"ı, 1980-ci ildə heyvandarlıq sahəsi üzrə yüksək göstəriciliyə görə Sovet İttifaqı Kommunist Partiyası Mərkəzi Komitəsinin, SSRİ Nazirlər Sovetinin və SSRİ Həmkarlar İttifaqı Mərkəzi Şurasının "Keçici Qırmızı Bayrağı" və "Niva" markalı maşını, 1988-ci ildə taxılçılıq sahəsi üzrə göstərdiyi yüksək göstəricilərə görə SSRİ Xalq Təsərrüfatları Nailiyyətləri Sərgisinin diplomu ilə təltif olunub.

1918-ci ildə Azərbaycan Xalq Cümhuriyyəti qurulduqdan sonra Faxralı kəndindən Mürsəl (Hüseynalı nəsilindən), İslam (Orucməmmədli nəslindən), İdris və Rəhim (Xanəhmədli nəslindən) müsavat əsgərləri olub. Onların Azərbaycan Xalq Cümhuriyyəti yaranmasında və onun qorunub saxlanılmasında müəyyən xidmətləri olmuşdur. Müsavat əsgərləri İrana keçən zaman Mürsəl Araz çayını keçəndə suda boğularaq ölüb.

Kəndin Hüseyn müəllimgilin indiki həyətyanı sahəsinin ərazisində məscidi olub. Əhalinin heyvandarlığa, əkinçiliyə,

xalçaçılığa, sənətkarlığa və ticarətə meyli olduğu kimi təhsilədə marağı çox olub. O vaxt təhsil dini üslubda aparılıb. XIX əsrin sonlarında və XX əsrin əvvələrində məscidin axundu "Bəylik" nəsilindən olan İsmayıl bəy və "Ağalıq" nəslindən olan Molla Mustafa olub. Sonralar məscidin axundu İlisudan gəlmə olub.



**Şəkil 11. Deyilənlər əsasında Saləddin müəllim tərəfindən çəkilmiş Faxralı kənd məscidi**

Deyilənlərə görə Axund "Yetimlər" nəslində qalırmış və sonralar üç qardaş oxumağa göndərib. Oxuyanlar əmmamə aldıqdan sonra Süleyman kəndin axundu olub. İlisudan gələn axund isə öz vəsiyyəti əsasında İlisuya aparılaraq orada dəfn edilib. Kəndin məscidi SSRİ vaxtı K.Marks kolxozu qurulandan sonra təxminən 1931-1932-ci illərdə ateist iqtidarların təzyiqi altında anbar edilib. Sonralar tariximiz olan məscid təzyiq altında dağıdılıb və onun materiallarından kənd klubunun tikintisində istifadə edilib.

Faxralı sakinlərinin ziyarətgah yeri qəbiristanlıqda yerləşən "Qara daş" kimi tanınan hamar bir qara daş olub. Faxralı sakinləri 1960-cı illərə kimi bu qara daşı ziyarət ediblər. Bu daş indi də yerində qalmaqdadır. Deyilənlərə görə kim nə niyyət edib qaradaşa nəzir aparmışsa niyyətləri qəbul olunurmuş və ya niyyətləri qəbul olduqdan sonra qara daşın yanına nəzirlər qoyurmuşlar. Daşın

ətrafları bu gün də göründüyü kimi türbə formasında bağlı olub. Ehtimalıma görə bu qara daş yaxınlığında görkəmli şəxlərdən olan Şıx Məhəmməd (Fəzeyilli nəslindən olan Şıx Məhəmməddə qeyri adi istedalar varimiş. Deyilənlərə görə o, anidən Murov dağına gedib gələ bilirmiş. Həmçinin Şıx Məhəmməd xəstələrədə qeyri adi istedadı ilə şəfa da verirmiş.) dəfn edilib və deyilənlərə görə daş özü metroit parçasıdır.



**Şəkil 12. Faxralıların ziyarətgahı "Qara daş"**

Faxralıların dəyirmanı deyilənlərə görə əvvəllər təxminən Qaradağlı və Şadlı kəndləri arasında, Kürəkçay çayının sahilində olub. Sonralar Fəzeyilli nəsilindən olan Abdulla tərəfindən Korçay çayı sahilində dəyirman tikilib və bu dəyirmanı Hacı Əli işlədib. Kolxoz qurulduqdan sonra dəyirmanı Hacı Əli işlətdiyinə görə "Hacıəli" dəyirmanı kimi adlandırıblar. Faxralı kəndində aparılan sosial yönümlü işlər zamanı kənddə yeni bir elektirik dəyirmanı istifadiyə verilib və bu günə kimi həmin dəyirman istifadədədir.

Çox təəssüflə qeyd edim ki, bir çox represiya qurbanları kimi 1937-ci ildə Sovet hökümətində kolxoz quruculuğu əleyhinə çıxan Faxralı sakinləri İsgəndər, Güləhməd bəy, Mansur, Məşədi Həsən və

Kərim də repressiya qurbanları olublar. Onlara siyası dustaq adı verilib. Məşədi Həsən və Kərim Novosibirskdə dustaq həyatı yaşayıblar. Məşədi Həsən yazdığı məktubların birində Kərimin öldüyünü və onu öz əlləri ilə şinelə bükərək dəfn etdiyini söyləyib. Sonralar Məşədi Həsəndən də məktublar gəlməyib. Mansurun üzərindən siyasi dustaq damğası 80-ci illərdə götrülüb və məhkəmənin hökmü isə Mansurun varisi olan Cəlilə verilib.

Faxralı əhalisinin gözəl adət-ənənələri olub ki, onlardan da biri toy mərasimi olub. Toydan qabaq hər hansısa bir qıza elçi gedərmişlər. Qızın razılığı verilməyənə kimi süzülən çaylar içilməzmiş. Xüsusi qeyd etmək lazımdır ki, elçi gedilən qız verilmədikdə, həmin qıza başqa bir kimsə elçi getmirmiş. Buna görə də elçilər həmişə xoş xəbərlə qayıdıblar. Qızların cehizlərini kənd qadınları birlikdə hazırlayarlarmış, ələlxüsus cehizlik xalçanın toxunulması zamanı bir evdə birlikdə toplaşarlarmış. Elə bu səbəbdən də Faxralı xalçası məşhur çeşidli xalçalar içərisində özünəməxsus bir yer tutur. Çünki cəmlikdə toxunan xalçaçıların hər birinin üzərindəki çeşnilər, xalça toxuyanların zehinlərindən keçən bir çeşni olaraq bu xalça üzərində öz əksini tapıb. Qədimdən kənd əhalisi qırağa nadir hallarda qız verib, qız alıblar. Faxralılar həmişə bir-birlərinə kömək, arxa olublar, hətta evində bir çörəyi olan kimsə özü yarı ac qalarmış, çörəyinin yarısını həmkəndlisinə verərmiş. Həmrəylik nöqteyi nəzərindən də bir-birlərinə kömək olublar. Yas mərasimlərində də birlik göstərirlərmiş ki, ölüsü düşən bir kimsə dərin qəm qüssəyə qərq olmasın. Bir kimsənin başqa kəndlilərlə ədavətləri düşən zamanda da birlikdə dava-dalaşa gedərmişlər. Bu adət ənənələr hal-hazırda da Faxralı kəndinin əhalisində qalmaqdadır, necə deyərlər ot kökü üstə bitər.

Faxralıya keçmişdə də, indi də aşıq Faxralı deyirlər, cünki əcdadlarımız aşıq sənəti ilə də çox maraqlanıblar. İndinin özündə də bəzi faxralılar qoşmalar yaradırlar. O cümlədən faxralılar günümüzdə də aşıq mahnılarına çox həvəslə və sevə-sevə qulaq asırlar. Faxralı kəndində keçmiş aşıqların yarışmaları və deyişmələri keçrilib. Aşıq Alının ustadı aşıq Allahverdinin qohumu İnəkdağlı aşıq Kazımın çox zil səsi var imiş, lakin yetərincə aşıq sənətini öyrənə bilmədiyindən, 1925-ci ildə Gəncəyə köcərək, Bala Məzrəli Aşıq Qara ilə yoldaşlıq edib. Daha sonra Qazaxlı Telli Məhəmmədlə məclislər keçirən Aşıq Kazım aşıq sənətini davam etdirmək üçün Goranboy rayonunun Faxralı kəndinə gəlib, aşıq sevərliliyə heyran olaraq burada yaşayıb.

O, 1930-cu illərin sonunda Faxralıda dünyasını dəyişib. Faxralı kəndində eyni zamanda tar, qara zurna, balaban, qarmon, nağara çalanlar yaşayıb, hətta toy şənlikləri də keçiriblər. Bunlardan tarda Mustafa, Məhərrəm, İbrahim, Sərraf qara zurnada Paşa, Qulam, balabanda Salman, Tapdıq müəllim, qarmonda Əlihüseyn, Fərmayıl, nağarada Əşrəf, İmadı, Teyyub və s. adını çəkmədiyim neçə-neçə musiqi alətlərinin çalğıçıları olub və yaşayırlar. Faxralı kənd sakini Sadıqova Xalidə İsgəndər qızı Ü.Hacıbəyov adına Azərbaycan Dövlət Konservatoriyasını bitirib və hal-hazırda Bakı şəhərində müəllim və müğənni kimi fəaliyyət göstərir.

Faxralıların qışlaqları və heyvanlarının otlaq yerləri Korçay çayının sahilləri olduğundan, qədimdə Faxralıların ərazilərdə məskunlaşaraq yaydıqları Faxralı toponiminin çoxalması nəticəsində Goranboy rayonunun Faxralı kəndinin tanınması üçün Korçayın Faxralısı da deyirmişlər.

Faxralı kəndində təhsil ta qədimdən dini üslubda aparılıb. Belə ki, XIX əsrin sonu və XX əsrin əvvələrində təhsil almaq üçün İlisuya, Gəncəyə və başqa yerlərdə olan təhsil ocaqlarına gedərlərmiş və orada dini təhsil aldıqdan sonra əmmamə qoyaraq geri, kəndə gələrlərmiş. Bunlardan Şıx Məhəmməd, Molla Abdulla, Mirzə Yaqub, Məşədi Molla Əli, Molla Mustafa, İsmayıl bəy, Molla Məmməd, Molla Hüseyn, Molla İdris, Zaman, Sirəc, Süleyman, Məşədi Nağı və s. Faxralı sakinləri dini və dünyəvi elmlərdən təhsil almışlar. Keçmişdə təhsilli və sayılıb seçilən insanlara “Bəy”, “Ağa”, “Şıx”, “Molla”, “Məşədi”, “Kərbəlayı”, “Hacı”, “Mirzə” və s. kimi titullar verilirmiş. Faxralılar arasında da bu titullara layiq görülənlərin sayı çox olub.



**Şəkil 13. Faxralı kənd orta məktəbi (1966-ci il)**

Faxralı kəndində ilk dünyəvi məktəb 1919-cu ildə Əfəndiyev Yaqub Abdulla oğlu tərəfindən fərdi evdə açılmışdır. Yaqub müəllim tərəfindən açılmış ilk məktəbdə təhsil ibtidai sinif formasında aparılırdı. İbtidai təhsil ocağı kimi fəaliyyətə başlayan məktəb sonralar yeddiillik məktəbə çevrildi. Yeddiillik məktəbin direktoru Yaqub müəllim təyin edilmişdir. Yeddiilik məktəbin formalaşmasında və təhsilin yüksək səviyyədə keçrilməsində Yaqub müəllimin həyat yoldaşı Ədibə müəllimin də xüsusi xidmətləri olmuşdur. 1966-cı ildə isə yeni məktəb binasının təməli Faxralı kənd K.Marks (keçmişdə Faxralı, Alpout, Qurbanzadə kəndləri birlikdə Karl Marks kolxozu adlanırdı) adına kolxozun sədri Qurbanov Qurban İbrahimoğlu tərəfindən qoyuldu və həmin ildə də məktəb şagirdlərin istifadəsinə verildi. Faxralı kənd məktəbində direktor işləyən müəllimlərin siyahısı 6 saylı cədvəldə verilmişdir.



**Şəkil 14. Faxralı kənd uşaq bağçası**

Faxralı kəndində uşaq bağçası ilk dəfə 1920-ci ildə fəaliyyət göstərib. Həmin vaxt bağçada uşaqların tərbiyəçisi deyilənlərə görə Gülxanım arvad olub. Sonralar uşaq bağçasının müdiri Atlas, Kəmalə, Cəlalət və Raisə olub.

Kənddə Çökək məhlə, Xanımcanlı, Xanəhmədli, Fəzeyilli, Suyun üstü və təzə məhlə coyğaları (yaşayış massivi) mövcud olub. Bu coyğalarda nəsillər məskunlaşıblar. Coyğalar Ağcabəy arxının sağ və sol tərəflərində yerləşib. Arxın axını istiqamətində sağda cənub-şərqdə Çökək məhlə, şimal-şərqdə “Əyri arx” deyilən tərəfdə Fəzeyilli, arxın sol tərəfində cənub-qərbdə Xanəhmədli və Suyun üstü təzə məhlələr, şimal-qərbdə Xanımcanlı coyğaları olub.

**Çökək məhlə** coyğasında məskunlaşan nəsillər aşağıdakılardı:

- Yolçuoğullar;
- Novruzlular; Kökləri birdir
- Alılar;
- Yetimlər;
- Xurşudlular;
- Nəbioğullar;
- Orucməmmədlilər;
- Qocalar - Qululular;
- Daşılar;

- Durmuşdu;
- Mollanəbilər;
- Ağalıq;
- Xələflər;
- Ələstanlar;
- Məşədiəlilər;

**Fəzeyilli** coyğunda məskunlaşan nəsillər aşağıdakılardı:
- Bəylik;
- Göyüşdülər;
- Fəzeyilli;
- Xoylular;
- Fərzalılar;
- Qaramanlılar;

**Xanəhmədli** coyğasında məskunlaşan nəsillər aşağıdakılardı:
- Yarəhməd;
- Xanəhməd; } Həvilin övladlarıdır
- Məhəmmədlilər;
- Göyçəlilər (Sadıqlılar);
- Göycaylılar;

**Suyun üstü təzə məhlələr** coyğasında məskunlaşan nəsillər aşağıdakılardı:
- Nurular;
- Dələklilər;
- Namzlar;
- Hadılar;
- Bəhrəmlilər;
- Hacı Avdrahmanlılar;
- Sarılar.

**Xanımcanlı** coyğasında (Xanımcanlı iki hissədən Hacı Musa qolu və Göycələr qolundan ibarət olub) məskunlaşan nəsillər aşağıdakılardı:
- Mehdilər;
- Kosaoğluları;
- Məmmədyusifli;
- Tanrıqulular;
- Nağaalılar;
- Papılılar - Hacılar;
- Söyünalılar.

1920-ci ildə Azərbaycan Xalq Cumhuriyyəti Sovet Rusiyası tərəfindən işğal edildikdən sonra, Faxralı kənd sovetliyi yaradılıb. Sovetliyə sonradan 1924-cü ildə yaradılmış Qurbanzadə (inqilabçı Qurbanın şərəfinə belə adlandırılıb) kəndi (Irandan gəlib Faxralı əhalisinin təsərrüfatlarında işləyiblər. Sonradan Bayram kişinin torpaqlarından əkinçilik və heyvandarlıq üçün pay torpaqlar verilib) və 1956-cı ildə yaradılmış Alpout kəndi (Mingəçevirdə SES yaradılması ilə əlaqədar Kür çayının qarşısı bəndlənən zaman su altında qalan kəndlərdəndi. Sonradan Faxralı torpaqlarından əkinçilik və heyvandarlıq üçün pay torpaqlar verilib.) daxil edilib. 1920-ci ildən bu günə kimi işləyən kənd soveti sədrlərinin siyahısı 1 saylı cədvəldə verilmişdir.

1931-ci ilin mart ayının 15-də Faxralı kəndində Karl Marks adına kolxoz qurulub və 1997-ci ildə kolxoz sistemi ləğv edilərək Faxralı kənd İslahat Komissiyası yaradılıb. 2000-ci ildə bələdiyyə sisteminə keçirilib. 1931-ci ildə Faxralı kəndində kolxoz qurulan vaxt 136 fərdi təsərrüfat qeydə alınıb. Bu təsərrüfatlar 2 saylı cədvəldə göstərilib.

Faxralı kəndində 1931-1936-cı illərdə 18 fərdi təsərrüfat yaranmış və kənd 154 fərdi təsərrüratdan ibarət olub. Bu arada artan təsərrüfatlar 3 saylı cədvəldə göstərilib.

15 mart 1931-ci ildə Faxralı kəndində kolxoz qurulandan bəri işləyən kolxoz sədrlərinin siyahısı 4 saylı cədvəldə verilmişdir.

1936-cı ilin fevral ayının 1-də Xoyluyev Qasım tərəfindən yadigar məktub yazılaraq butulka içərisinə qoyulub kolxoz binasının özülünə atılmışdır. Qazıntılar zamanı tapılmış butulka içərisindəki məktub Kosayev Həbib İbrahim oğlu tərəfindən götrülüb saxlanılıb. Xoyluyev Qasım tərəfindən yazılmış yadigar məktubun mətni belədir: *“Yadigar. 1936-cı il 1 fevralda bu kağız yazılmışdır. Bu tarixdə bizim Karl Marks kolxozunda 700-ə qədər nufis (şəxs), bundan 340 qadın-kişi işçi və 154 fərdi təsərrüfat var idi. Həmin ildə nəğdi paya hər əmək gününə 6 manat 63 qəpik düşmüşdü. Həmin vaxt kolxozun sədri Nəcəf Abdulla oğlu Musayev idi və Faxralı kəndinin şura sədri Sarovlu Rəsul Orucov idi və kolxozun hesabdarı Qasım Xoyluyev idi. Katib Səlman Sadıqov idi. Kolxozun heyyət üzvüləri Qəhrəman Əli oğlu, İbrahim Kosayev, Əsbət Məhərrəm qızı, Kamıl Tağı oğlu, Qərib Qoşqar oğlu olub. Komsomol katibi Mustafa Xoyluyev. Kolxozun kassiri Məhəmməd Əli oğlu Faxralı kənd şura*

*katibi Həbib Kosayev, kolxozun ferma müdiri Oruc Hüseyn oğlu və su briqadiri Zaman Hüseyn oğlu idi. Həmin ildə kolxozun 600000 manata qədər gəliri olmuşdu. Həmin tarixi yazan Qasım Xoyluyev. 1.II. 1936-cı il* ***UNUTMAYIN.”***

Böyük Vətən Müharibəsi bütün diyarlar kimi Faxralı kəndində də dərin sağalmaz yaralar buraxıb. Belə ki, 1941-1945-ci illərdə Faxralı sakinlərindən bir neçəsi müharibədə iştirak edib qayıdıb, bir neçəsi müharibədə yaralanıb qayıdıb və Faxralı kəndinin 64 sakini müharibəyə gedib qayıtmayıb. Qayıtmayan Faxralı sakinlərindən bu günə qədər bir Əhmədov İsbəndiyar haqqında məlumat var, belə ki, İsbəndiyar kişi 1942-ci ildə Rusiya Federasiyasının Krasnadar vilayəti Ordinski rayonunun Risivıy savxozu ətrafında gedən döyüşlərdə həlak olaraq elə orada da dəfn edilmiş və həmin ərazidə ölənlrin xatirəsinə abidə uçaldılaraq adları abidənin üzərinə yazılmışdır. Böyük Vətən müharibəsində iştirak edib geri qayıtmayan 63 Faxralı kənd sakinləri barəsində heç bir məlumat yoxdur. Təəssüflə qeyd edim ki, Kərbəlayi Babanın beş oğlu Böyük Vətən müharibəsinə gedib və geri qayıtmayıblar. O cümlədən bir ailədən ata və oğlanları gedib heç biri geri dönməyib. Han-sı ki, bu ailənin xanımı, anası İpar arvad tək qalıb. O, qadın həyat yoldaşı Hüseyni, oğlanları İbrahim və Qoşqarı son nəfəsinə qədər Faxralı kəndinin girəcəyində “Taxta” körpü adlanan körpünün yanında gözləyib. Ancaq istəyinə nail olmadığından vəsiyyət edib ki, onu elə oradaca dəfn etsinlər ki, ana bir zaman dönəcəklərini ehtimal etdiyi əzizlərini soyuq məzarı önündə qarşılasın. Faxralı əhalisi də İpar arvadın vəsiyyətinə əməl edib, onu elə oturub əzizlərini gözlədiyi yerdə dəfn ediblər. Böyük Vətən müharibəsinə gedib gəlməyənlərin adları 5 saylı cədvəldə verilmişdir.

1955-1957-ci illərdə Faxralı kəndində 5 ədəd neft quyuları qazılıb. Belə ki, bir quyu “Qarasuda”, bir quyu keçmiş toyuq fermasının yanında, bir quyu “Sarı təpə”nin yanında, bir quyu Nizami dayıgilin evlərinin yanında və bir quyu indi isti su kimi tanınan su quyusudur. Onlardan dörd quyudan neft qarışığı su çıxıb və bir quyudan isə isti su çıxıb, bu su quyusu hal-hazırda da əhali tərəfindən istifadə edilir. Neft çıxan quyuların birindən, yəni toyuq fermasının yanındakı neft quyusundan bir müddət maşınlarla neft daşınıb. Sonralar hər dörd quyu blomlanaraq bağlanıb. 1986-cı ildə “Qalmaz” Qaz Qazma neft axtarışı şirkəti tərəfindən kəndin cənub

qərb tərəfində Ağcabəy çayının sol tərəfində kəşfiyyat quyusu qazılıb və heç nə tapılmadığından blomblanaraq bağlanıb.

Böyük Vətən müharibəsindən sonra hər yerdə olduğu kimi Faxralı kəndində də bir çox çətinliklər mövcud olmuşdur. Zaman keçdikcə faxralılar çətinliklərə sinə gələrək özlərinin çiçəklənmə dövrlərinə qədəm qoymağa başlamışlar. Belə ki, 1956-1957-ci ildə Faxralı kəndinə işıq çəkildi. 1966-cı ildə Faxralı kəndi **Qurban Qurbanovun** rəhbərliyi sahəsində daha da inkişaf edərək, yeni bir mərhəlyə qədəm qoydu. Həmin tarixdən Faxralı kəndinin gəlirləri düzgün sosial-iqtisadi yönümdə xərclənməyə başladı. 1966-cı ildən başlayaraq kəndin baş planı tərtib edilərək, faxralılar üçün lazım olan bütün infrastrukturlar tikilməyə başladı. Faxralı kəndinin əhalisini daimi içməli su ilə təmin etmək üçün, 1972-1973-cü illərdə mənbəyini Kürəkçaydan götürən içməli su anbarı tikilib və borular vasitəsi ilə kəndə çəkilərək sakinlərin istifadəsinə verilmişdir. Faxralı kənd əhalisinin gediş-gəlişinin rahatlığı üçün isə, 1972-1973-cü illərdə Dəliməmmədli qəsəbəsindən Faxralı kəndinə 8 km-lik asfalt yol çəkilmişdir. 1976-cı ildən evlərin qazla təmin olunması işlərinin başlanması nəticəsində, 1982-1983-cü illərdə Faxralı kənd evlərində əhali təbii qazdan istifadə etdi.

Faxralı kəndində bu günümüzə kimi gəlib çıxan bir çox torpaq sahələrinin adları var. Bunlar Qaramanlı yeri, Xanəhmədli torpaqları, Şərif yeri, Bəylik qoruqları, Bayan yeri, Kiçik Çaqqallı, Böyük Çaqqallı, Şirinbəy yeri, Çəkillik, Bağ yeri, Bala düz, Fatı oğlu, İrəvanlı yeri, Xələf yeri, Qaradaş yeri, Ayrım yeri və s. kimi torpaq sahələrinə verilən adlardır.

Faxralı kəndinin əraziləri qədim yaşayış məskəni olduğundan bu ərazilərdə arxeloji qaıntılar aparılması çox zəruridir. Belə ki, 1 və 5 metr dərinlikdə müxtəlif yerlərdən arxeloji tapıntılar tapmaq olar. Kəndə arxeoloji qazıntıların aparılması üçün mühüm olan yerlərin adlarını burada qeyd etməyə özümə borc bilirəm:
Qaramanlı yerində, kəndin girəcəyində cənub-qərbdə Ağcabəy çayının sol və sağ tərəflərində, Məhyəddin dayıgilin həyətyanı sahəsi, Səmil dayı və Rəşid müəllimgilin yaşadıqları ərazilər, yəni Əyri arxın şimal qərb tərəfi, kəndin girəcəyində İsagilin həyətyanı sahəsi, kəndin mərkəzində, uşaq bağçasının həyətinin qarşısında yolun kənarı, Çəkillik deyilən yerdə, Sarı təpədə, Sarı təpədən Bayan

yerinə gedən yolun sol tərəfində, kəndin girəcəyində artezian quyusunun ətrafında, Sirəc təpəsinin ətrafında və s.




**Şəkil 15. Faxralı kəndində olan tapıntılar**

# Faxralı kəndində işləyən kənd soveti sədrlərinin siyahısı

**Cədvəl 1**

| S/S | Soyadı adı | İllər | Yeri |
|---|---|---|---|
| 1 | Kosayev İbrahim | 1920-1928 | Faxralı |
| 2 | Babayev Almaz | 1929-1930 | Qurbanzadə |
| 3 | Əliyev İbrahim | 1930 əvvəli | Tolalı tatı |
| 4 | Qarayev Eynulla | 1930 axırı | Ağamalıoğlu |
| 5 | Salayev Yusif | 1931 əvvəli | Bakıfəhləsi |
| 6 | İbrahimov Allahverdi | 1931 axırı | Goranboy |
| 7 | Babayev Novruz | 1932 əvvəli | Bakıfəhləsi |
| 8 | İbrahinov Yusif | 1932 axırı | Hazırəhmədli |
| 9 | Rzayev Cəfər | 1933 əvvəli | Şəmkir |
| 10 | Nəbiyev İsmayıl | 1933-1934 | Xoylu |
| 11 | Orucov Rəsul | 1934-1936 | Sarov |
| 12 | Cəfərov Cəfər | 1936-1937 | Naxcıvan |
| 13 | Məmmədov Süleyman | 1937-1938 | Əzizbəyov |
| 14 | Cəfərov Gorus | 1938-1940 | Ağamalıoğlu |
| 15 | Sadıqov Səlman | 1940-1942 | Faxralı |
| 16 | Əliyeva Fatma | 1942-1945 | Faxralı |
| 17 | Məmmədov Süleyman | 1945-1948 | Əzizbəyov |
| 18 | Sadıqov Qiyas | 1948 | Faxralı |
| 19 | Əliyeva Fatma | 1948-1951 | Faxralı |
| 20 | Hüseynova Bəsti | 1951-1952 | Faxralı |
| 21 | Əmrahov Əmrah | 1952-1961 | Dəliməmmədli |
| 22 | Musayev Qara | 1961-1974 | Faxralı |
| 23 | Məmmədov Fidayıl | 1974-1984 | Alpout |
| 24 | Məmmədova Qahirə | 1984-1987 | Alpout |
| 25 | İsmayılov Əbdürrəhman | 1987-1991 | Faxralı |
| 26 | Qurbanov Qurban | 1991-1992 | Faxralı |
| 27 | Daşıyev Faxrəddin | 1992-1993 | Faxralı |
| 28 | Sadıqov Rafayıl | 1993-2000 | Faxralı |
| 29 | İsmayılov Əbdürrəhman | 2000- | Faxralı |

# Kolxoz qurulanda Faxralı kəndində olan təsərrüfatların siyahısı

**Cədvəl 2**

| | | | | |
|---|---|---|---|---|
| Mansır Həbib oğlu | Qəhrəman Əli oğlu | Bəylər bəy | Nəsib Alı oğlu | Meydanalı Məhəmməd oğlu |
| Rəhim Vəli oğlu | Oruc Hüseyn oğlu | İsmayıl Təhmid oğlu | Ədil Xaqan oğlu | İsmayıl Anri oğlu |
| Bəhrəm Vəli oğlu | Mollaməmməd Hüseyn oğlu | İsmayıl İman oğlu | Məmməd Musa oğlu | Nadir Alı oğlu |
| Hüseyn Qulu oğlu | Məhəmmədəli Hüseyn oğlu | Camal İman oğlu | Mirzalı Mikayıl oğlu | YekəNəsif Mustafa oğlu |
| Zeynəlabdı Məhəmməd oğlu | Qərib Qoşqar oğlu | Cavad İman oğlu | Bədir Qulu oğlu | Musa Hüseyn oğlu |
| Qazax Alı | Teymur Nəbi oğlu | Əmir Nəsib oğlu | İman Vəli oğlu | MollaƏli Musa oğlu |
| Molla Hüseyn | Rəhim Abdulla oğlu | İslam Mustafa oğlu | Cəbrayıl Məhəmməd oğlu | Əlxas Hasan oğlu |
| Qənbər Məhərrəm o. | İbrahim İbrahim oğlu | Yusif Kərim oğlu | İbrahim Qurban oğlu | Nəcvəddin Həsən oğlu |
| İlyas Gəncəli oğlu | Əbil Məhəmməd oğlu | Mehralı Məhəmməd oğlu | M.Hacı Məmməd oğlu | Nəcəf Musa oğlu |
| İsmayıl Bayram oğlu | Mədət Hüseyn oğlu | Qasım Mustafa oğlu | Kərim Tatılı oğlu | Həmid Qasım oğlu |
| Qiyas Məmməd oğlu | Səməd Hüseyn oğlu | Yusif Mustafa oğlu | İsmayıl Hacı oğlu | Sarı Göyüş Sadıq oğlu |
| Qədim Oruc oğlu | Həsən Vəli oğlu | Qədim İsmayıl oğlu | M.Həsən Kazım oğlu | Məşədi Nağı Məmməd oğlu |
| | Binnət Məmməd oğlu | Yunus İsmayıl oğlu | Yusif İsmayıl oğlu | Vəli Əbdül-rəhman oğlu |
| Aslan Əlibəy oğlu | Bayram kişi Alı oğlu | Qəhrəman Bayram oğlu | Camal Durmuş oğlu | Hacı İsgəndər Hüseyn oğlu |
| Muxtar Nəbi oğlu | Hüseyn Məhəmməd oğlu | Zaman Bayram oğlu | Sari Həmid oğlu | Kalvaybaba Məhəmməd oğlu |
| Sirəc Əbdülrəhman oğlu | Aslan Məhəmməd oğlu | İslam Bayram oğlu | Dövrüş Xurşud oğlu | Pundalı Baba oğlu |
| Məhəmməd Narın oğlu | İslam Məhəm-məd oğlu | Vəli Mütəllim oğlu | İsmayıl (yorğa) | Binnət Həsrət oğlu |

| | | | | |
|---|---|---|---|---|
| Mövsüm Cəfər oğlu | Ələsdan Əhməd oğlu | Əbdülrəhman Məhyəddin oğlu | Əli Vəli oğlu | Abbas Məhəmməd oğlu |
| Məşədiəli Məhəmməd oğlu | Hüseyn İsmayıl oğlu | Zaman Hüseyn oğlu | Məhəmməd İsmayıl oğlu | Baba Məhəmməd oğlu |
| Hadı Süleyman oğlu | İsgəndər bəy | İlyas Hüseyn oğlu | Bəhrəm İsmayıl oğlu | Dilənci Həsən oğlu |
| Nəsib Nağdalı oğlu | İsbəndiyar bəy | Qasım Göyüş oğlu | Binnət Şirin oğlu | Paşa İbrahim oğlu |
| Göyüş Əhməd oğlu | Musa bəy | Rəhim Göyüş oğlu | Dəli Paşa | Yaqub Abdulla oğlu |
| Həsən Əhməd oğlu | Ağa bəy | Qurban Allahverdi oğlu | İslam Nuru oğlu | Məhəmmədcamal Abdulla oğlu |
| Məhəmməd Allahverdi oğlu | Hidayət bəy | Ləzgi Məhəmməd | Zaman Musa oğlu | Ağakişi Kərimoğlu |
| İdris Allahverdi oğlu | Ağalar bəy | İbrahim Yusib oğlu | Abdulla Məhəmməd oğlu | |
| Nəsib Namaz oğlu | Güləhməd bəy | Müseyib Alı oğlu | İbrahim Şahbazov | |
| Hacıməmməd Mustafa oğlu | Fəhrad bəy | Alıkişi Xudaverdi oğlu | Qıx Mahmud | |
| Tat Hacı | Böyük Ağa | Novruz Alı oğlu | Yusibəli Baba oğlu | |

## 1931-1936-cı illərdə artan təsərrüfatların siyahısı

**Cədvəl 3**

| | | | | |
|---|---|---|---|---|
| Talıb Molla Məmməd oğlu | Səlman Hüseyn oğlu | Eyyub Əli bəy oğlu | Məsim Əli oğlu | Fərhad Süleyman oğlu |
| Məhəmməd Akıftalı oğlu | Tat Əkbər | Əhməd Göyüş oğlu | Bəhlul Baba oğlu | İsaq Həsrət oğlu |
| Hidayət Mədət oğlu | Dəllək Hacı | Kamran Hüseyn oğlu | Ağaməmməd Baba oğlu | |
| Kamıl Tağı oğlu | Rüstəm Əli bəy oğlu | Ələkbər Vəli oğlu | Polad Əli oğlu | |

# Kolxoz qurulandan işləyən sədrlərin siyahısı

**Cədvəl 4**

| S/S | Soyadı Adı | İşlədiyi illər | Yeri |
|---|---|---|---|
| 1 | Kosayev İbrahim | 1931-1932 | Faxralı |
| 2 | Yusibov Əbdürrəhman | 1932 | Faxralı |
| 3 | Kərimov Çikrin | 1933 | Ağamalıoğlu |
| 4 | Sadıqov Qiyas | 1934 | Faxralı |
| 5 | Musayev Nəcəf | 1935-1938 | Faxralı |
| 6 | Əliyev Məhəmməd | 1939-1940 | Faxralı |
| 7 | Xoyluyev Qasım | 1940-1941 | Faxralı |
| 8 | Kosayev Həbib | 1942 | Faxralı |
| 9 | Daşdəmirov İsrafil | 1943-1944 | Baxçakürd |
| 10 | Aşurov Aslan | 1944-1945 | Safıkürd |
| 11 | Məmmədov Cümşüd | 1946-1948 | Cinliborsunlu |
| 12 | Əliyev Məhəmməd | 1949-1951 | Faxralı |
| 13 | Əhmədov Ədil | 1952-1955 | Baxcakürd |
| 14 | Qurbanov Qurban | 1956-1982 | Faxralı |
| 15 | Vəliyev Cəlil | 1982-1985 | Faxralı |
| 16 | Kərimov Mansur | 1985 axırı | Alpout |
| 17 | Qurbanov Əli | 1986 | Faxralı |
| 18 | Kərimov Mansur | 1987 | Alpout |
| 19 | Vəliyev Şikar | 1988-1991 | Faxralı |
| 20 | Həmidov Vahid | 1991-1992 | Faxralı |
| 21 | Sadıqov Zahid | 1992-1993 | Faxralı |
| 22 | Vəliyev Cəlil | 1993-1997 | Faxralı |

## 1941-1945-ci ildə cəbhəyə gedib-gəlməyənlərin siyahısı

**Cədvəl 5**

| | | | | |
|---|---|---|---|---|
| 1.Abdullayev Əmirəhməd Ə.o | 14.Əhmədov İsfəndiyar A.o | 27.Kosayev Ələkbər B.o | 40.Məmmədov Qoşqar Hüseyn oğlu | 53.Nəbiyev Eyyub Ə.o |
| 2.Abdullayev Əşrəf A.o | 15.Əliyev Qəhrəman Ə.o | 28.Kosayev Tapdıq İ.o | 41.Məmmədov Məhəmməd H.o | 54.Nəbiyev Yaqub M.o |
| 3.Abdullayev Rəhim A.o | 16.Hacıyev Binnət M.o | 29.Kosayev Zakir B.o | 42.Məmmədov Mikayıl C.o | 55.Nəbiyev Yusif İ.o |
| 4.Alıyev Hüseyn M.o | 17.Hacıyev Yusif Camal oğlu | 30.Quluyev Cəfər (aralıq) | 43.Məmmədov Tapdıq H.o | 56.Sultanov İbrahim İ.o |
| 5.Alıyev Nüsrət H.o | 18.Hüseynov Abdulla M.o | 31.Quluyev Dilənçi Həsən o. | 44.Məmmədov Pundalı Baba oğlu | 57.Süleymanov İbiş F.o |
| 6.Allahverdiyev Camal Q.o | 19.Hüseynov Hidayət M.o | 32.Quluyev Yusif B.o | 45.Mustafayev Həsən S.o | 58.Süleymanov Sarı H.o |
| 7.Allahverdiyev İdris Q.o | 20.Hüseynov İlyas C.o | 33.Məhərrəmov Qaryağdı Q.o | 46.Musayef İsrafil M.o | 59.Süleymanov Tapdıq F.o |
| 8.Bayramov Əli B.o | 21.Hüseynov Vəliyəddin İlyas oğlu | 34.Məhərrəmov Talıb M.o | 47.Musayev Nəcəf A.o | 60.Şirinov Ağası B.o |
| 9.Bayramov Mustafa Ə.o | 22.Xocanov Bayram Ə.o | 35.Məmmədov Ağaməmməd Baba oğlu | 48.Musayev Zahid Ə.o | 61.Şirinov Binnət M.o |
| 10.Babayev Yusibəli Ə.o | 23.İsmayılov Ağalar C.o | 36.Məmmədov Bəhlul Baba oğlu | 49.Namazov Dəmir N.o | 62.Vəliyev Abdulla B.o (kasıb) |
| 11.Cəfərov Şəmil H.o | 24.İsmayılov Fərhad B.o | 37.Məmmədov Əsəd Baba oğlu | 50.Namazov Əmir Y.o | 63.Vəliyev Cəbrayıl R.o |
| 12.Əhmədov Bəkir K.o | 25.İsmayılov Qəyyum B.o | 38.Məmmədov Xosrov Baba oğlu | 51.Namazov Xanlar Y.o | 64.Yusifov Məhəmməd |
| 13.Əhmədov Əhməd K.o | 26.Kərimov Hacı K.o | 39.Məmmədov İbrahim Hüseyn oğlu | 52.Nəbiyev Əsgər Ə.o | |

# Faxralı kənd orta məktəbində işləmiş direktorların siyahısı

**Cədvəl 6**

| s/s | Soyadı, adı və atasının adı | İşlədiyi illər | Olduqları yer |
|---|---|---|---|
| 1 | Əfəndiyev Yaqub Abdulla oğlu | 1919-1946 | Faxralı |
| 2 | Əli | 1946-1953 | Qazax |
| 3 | Mirzəyev İsax Həsən oğlu | 1953-1957 | Xanqərvənd |
| 4 | Məmmədov Fiday | 1957-1964 | Alpout |
| 5 | İsmayılov Əsəd Yusif oğlu | 1964-1967 | Faxralı |
| 6 | Daşıyev Fəxrəddin Əli oğlu | 1967-1968 | Faxralı |
| 7 | Məmmədov Fiday | 1968-1970 | Faxralı |
| 8 | Daşıyev Fəxrəddin Əli oğlu | 1970-1973 | Faxralı |
| 9 | Məmmədov Fiday | 1973-1974 | Faxralı |
| 10 | Məmmədov Əli Dilən oğlu | 1974-1977 | Dəliməmmədli |
| 11 | Daşıyev Fəxrəddin Əli oğlu | 1977-1978 | Faxralı |
| 12 | Həsənov Aydın Məhəmməd oğlu | 1978-1979 | Faxralı |
| 13 | Daşıyev Fəxrəddin Əli oğlu | 1979-1980 | Faxralı |
| 14 | Çobanzadə Nataşa Oruc qızı | 1982-1989 | Faxralı |
| 15 | Həmidov Ozelman Vahid oğlu | 1989-1990 | Faxralı |
| 16 | Çobanzadə Nataşa Oruc qızı | 1990-1998 | Faxralı |
| 17 | İsmayılov Möhtəşəm Ağalar oğlu | 1998-2000 | Faxralı |
| 18 | Daşıyev Fəxrəddin Əli oğlu | 2000-2003 | Faxralı |
| 19 | Cəfərova Təranə Mehdi | 2003-2007 | Ağamalıoğlu |
| 20 | İsmayılov Bəxtiyar Möhtəşəm oğlu | 2007 | Faxralı |

# DÖVLƏT QULLUQÇULARI



**Həsənov Məhərrəm Nəcvəddin oğlu** 07 sentyabr 1955-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1962-ci ildə Faxralı kənd orta məktəbin 1-ci sinfinə gedib və 1972-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1973-cü ildə S.Ağamalıoğlu adına Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun "Kənd təsərrüfatının iqtisadiyyatı və təşkili" fakültəsinə daxil olub, 1978-ci ildə oranı bitirib və "İqtisadçı Təşkilatçı" ixtisasına yiyələnib. 1993-cü ildə Bakı "Sosial İdarəetmə və Politologiya" institutunu qiyabi bitirərək "Politoloq" ixtisasına yiyələnib.

1978-1982-ci illərdə Qəbələ rayonundakı "Kuybışev" adına kolxozda baş iqtisadçı, 1983-cü ildən 1986-cı ilədək Qasım İsmayılov (indiki Goranboy) rayonunun Statistika idarəsinin rəisi, 1986-1990-cı illərdə Qasım İsmayılov (indiki Goranboy) rayon Partiya Komitəsində Kənd Təsərrüfatı şöbəsinin müdiri, 1990-1991-ci illərdə rayon XDSİK-də müavin, 1991 1992-ci illərdə rayon Aqrokombinatının baş direktoru, 1992-1995-ci illərdə rayon İcra Hakimiyyətində şöbə müdiri, 1995-1996-cı illərdə Goranboy Rayon Əhalinin Sosial Müdafiəsi mərkəzinin direktoru, 1996-2000-ci illərdə Goranboy rayon İcra Hakimiyyəti Başçısının İqtisadi məsələlər üzrə müavini, 2000-2002-ci illərdə Goranboy RİH-də şöbə müdiri vəzifələrində işləyib. 2002-ci ildən hal–hazıradək Goranboy rayonunun Kooperativ Cəmiyyətinin sədri vəzifəsində çalışır.

1990-1993-cü illərdə Qarabağ uğrunda gedən döyüşlərdə Ağcakənd və Tapqaraqoyunlu kəndləri istiqamətində mənfur ermənilərə qarşı vuruşub. Qarabağ müharibəsi veteranıdır.

İşlədiyi müddət ərzində heç bir töhmət və tapşırıq almayıb.Üç övladı var.



**İsmayılov Əbdürrəhman Yahya oğlu** 24.10.1957-ci ildə Qasım İsmayılov rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirib (1965-1975). Azərbaycan

Kənd Təsərrüfatı İnstitutunun "Kənd təsərrüfatının mexanikləşdirilməsi" fakültəsini bitirib, mühəndis mexanik ixtisasına yiyələnib (1977-1982). Qasım İsmayılov rayonunun "Karıl Marks" kolxozunda kolxozçu (1975-1977), Maşın Traktor parkında çilingər, azad komsomol komitəsinin sədri (1982-1983), azad həmkarlar təşkilatının sədri (1983-1987), kənd XDS-nin icraiyyə komitəsinin sədri (1987-1991) işləyib. 2000-ci ilin iyun ayından hal-hazıra kimi Goranboy rayonunun İcra Hakimiyyəti başçısının Faxralı kənd inzibati ərazi dairəsi üzrə nümayəndəsi vəzifəsində işləyir. Qarabağ uğrunda gedən döyüşlərdə iştirak edib. Qarabağ müharibəsi veteranıdır. Üç övladı var.



**Kosayev Həbib İbrahim oğlu** 25 yanvar 1916-cı ildə Faxralı kəndində anadan olmuşdur. Şuşa kənd təsərrüfatı texnikumunun zootexniklik şöbəsini qiyabi bitirmişdir. 1936-cı ildə Faxralı kənd şurasının katibi, 1942-ci ildə K.Marks adına kolxozun sədri, Murquzalılar kəndində kolxoz sədri, Qazaxlar kəndində kolxoz sədri, Dəliməmmədli qəsəbəsində kənd istehlakçılar cəmiyyətinin sədrinin müavini, rayon partiya komitəsində təlimatçı, K.Marks kolxozunda anbardar, ferma müdiri, arxiv müdiri vəzifələrində işləmişdir. Kənd soveti deputatı olmuşdur (1952-1990). Böyük Vətən Müharibəsində arxa cəbhədə xidmət etmişdir.

**"Böyük Vətən Müharibəsi Qələbəsinin 20 illiyi"** medalı (1965), **"Leninin Yüzilliyi"** medalı (1970), **"Əmək Şöhrəti"** III dərəcəli ordeni (1975), **"Böyük Vətən Müharibəsi Qələbəsinin 30 illiyi"** medalı (1975), **"Əmək Veteranı"** medalı (1977), **"Böyük Vətən Müharibəsi Qələbəsinin 40 illiyi"** medalı (1985), **"Böyük Vətən Müharibəsi Qələbəsinin 50 illiyi"** medalı (1995) ilə təltif olunmuşdur.

Bir çox gündəliklər yazıb, o cümlədən Faxralı kənd soveti yaranandan işləyən sovet sədrlərinin, K.Marks kolxozu yaranandan işləyən kolxoz sədrlərinin, Böyük Vətən Müharibəsinə gedib qayıtmayanların siyahısını öz gündəliklərində qeyd edib. 2000-ci ildə vəfat edib.



**Qurbanov Əli İbrahim oğlu** 1936-cı ildə Qasım İsmayılov rayonunun (indiki Goranboy) Faxralı kəndində anadan olmuşdur. Orta məktəbi bitirdikdən sonra Kirovabad (indiki Gəncə) Pedoqoji İnstitutuna qəbul olub və həmin institutu "Fizika riyaziyyat" ixtisası üzrə bitirib. Qasım İsmayılov (İndiki Goranboy) rayonunun Dəliməmmədli qəsəbəsi orta məktəbində riyaziyyat müəllimi (1960-1963), Dəliməmmədli qəsəbəsi orta məktəbində direktor müavini (1963-1971), Qasım İsmayılov rayon Partiya Komutəsinin Siyasi Maarif Kabinetinin müdiri (1971-1973), Təbliğat-təşviqat şöbəsinin müdiri (1973-1975), Qasım İsmayılov rayon ZDS icraiyyə komitəsinin sədr müavini (1975-1981), 102 saylı Kənd Orta Texniki Peşə məktəbinin direktoru (1981-1983), müəllim (1983), Qasım İsmayılov rayonunun Sarov kəndi "Azərbaycan" kolxozunun sədri (1983-1985), Azad Partiya komitəsinin katibi (1985), Qasım İsmayılov rayonunun Faxralı kəndi K.Marks adına kolxozununun idarə heyətinin sədri (1986-1987), Qasım İsmayılov rayonunun Dəliməmmədli qəsəbəsi orta məktəbində direktor müavini (1987-1996) və müəllim (1996-2000) vəzifələrində işləmişdir.

1974 və 1976-cı illərdə **"Sosializm Yarışının Qalibi"** döş nişanları, **"SSRİ OADKYC"-nin** fəxri nişanı (1977) və **"Əmək Veteranı"** medalı (1987) ilə təltif olunub.

Üç övladı var. Dəliməmmədli qəsəbəsində yaşayıb. 2009-cu ildə vəfat edib. Faxralı kənd qəbristanlığında dəfn edilib.



**Qurbanov Xəzail Süleyman oğlu** 25 oktyabr 1951-ci ildə Qasım İsmayılov (İndiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi qurtarandan sonra Çingiz İldırım adına Azərbaycan Dövlət Poltexinik İnstitutuna qəbul olub və oranın mexanika fakültəsini bitirib (1969-1974). İnstitutu bitirdikdən sonra təyinatla tikilməkdə olan Bakı Məişət Kondisonerlər zavoduna göndərilmişdir. Bakı Məişət Kondisonerlər Zavodu tərəfindən göndərişlə Rusiyanın Tolyatti şəhərində 1974-cü ilin oktyabr ayından 1975-ci ilin yanvar ayına kimi üç aylıq ixtisasartırma kursu keçdikdən sonra əmək fəaliyyətinə başlayıb.

Bakı Məişət Kondisonerlər zavodunda mühəndis, sex ustası, baş usta, növbə rəisi, sex rəisinin müavini (1975-1984), Nazirlər Sovetində Ağır Sənaye şöbəsində baş referent (1984-1986), Azərbaycan KP (Kommunit Partiyası) MK-nin (Mərkəzi Komitəsi) qərarı ilə Azərbaycan Elektro İşıq Elm İstehsalat Birliyində baş direktor (1986-1990), Azərbaycan Elektro İşıq Elm İstehsalat Birliyində baş mühəndis (1990-2000), Bakı Qalantereya ASC-də baş direktor (2000-2003), Bakı Saxsı Qablar ASC-də baş direktor (2003-2004) vəzifələrində işləyib. 2004-cü ildən hal-hazıra kimi özünün təsis və rəhbərlik etdiyi "Buta" tikiş MMC-də işləyir. Bu müəssisə Azərbaycan Respublikası güc nazirliklərinin səxsi heyəti üçün xüsusi geyim əşyalarının istehsalı ilə məşğuldur.

Marksizim-Leninizim Universitetini fərqlənmə diplomu ilə bitirib (1980-1982). İstehsalat birliyinin komsomol komutəsi katibinin müavini (1976-1978) və sex partiya təşkilatının katibi olub (1978-1982). Dəfələrlə Azərbaycan Respublikası Komsomol Təşkilatının Qurultaylarında və Respublika Partiya Təsərrüfat Fəalları Yığıncağında iştirak edib. Bir neçə dəfə Azərbaycan Respublikası KP MK bürosunun iclaslarında iştirak edib. Bakı şəhər Komsomol Komitəsının üzvü olub.

Bir neçə dəfə Bakı şəhər İstehsalat Birliyinin **"Fəxri Fərmanı"** ilə təltif olunub. İstehsalatda bir çox səmərələşdirilmiş təklifləri olub. "Baş leytenant" rütbəsi ilə istefada olan zabitdir. Üç övladı var.



**Qurbanov Qurban İbrahim oğlu** Qırmızı Əmək Bayrağı ordenli kənd təsərrüfatı mütəxəssisi. Qasım İsmayılov (İndiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub (1930). Kirovabad (indiki Gəncə) Kənd Təsərrüfat Texnikumunu (1947), Bakı Ali Partiya məktəbini (1970) bitirib. Qasım İsmayılov (indiki Goranboy) rayonunun Qurbanzadə, Faxralı, Alpout kəndlərində aqronom, baş aqronom, sədr müavini (1947-1956), K. Marks adına kolxozun (indiki Faxralı bələdiyyəsi) sədri (1956-1981), Qasım İsmayılov Rayon XDS İK-nin sədri (1981-1985), Qasım İsmayılov Rayon Aqrar-Sənaye birliyinin rəisi (1985-1986), K. Marks adına kolxozun (Faxralı, Alpout, Qurbanzadə kəndləri) aqronomu (1988-1989 ), Faxralı kənd XDS İK-nin sədri (1990-1991), Goranboy rayon

İcra Hakimiyyətinin Faxralı kəndi üzrə nümayyəndəsi vəzifələrində işləyib (1991-1992). 1993-cü ildən 2008-ci ilədək Azərbaycan Elmi-Tədqiqat İpəkçilik İnstitutunun Goranboy rayonunda yerləşən Faxralı təcrübə bazasının rəhbəri işləyib. Kəndin planlaşdırılmasına, abadlaşdırılmasına xüsusi fikir verən Q.Qurbanovun Faxralı kəndi K.Marks adına kolxozda sədrlik etdiyi dövrdə, kolxoz idarəsi və kənd soveti üçün yeni tipli inzibati bina, 460 yerlik orta məktəb, 120 yerlik uşaq bağçası, 180 yerlik mədəniyyət evi, kitabxana, məişət evi, hamam, rabitə şöbəsi, ticarət və ictimai obyektlər tikilib kənd əhalisinin istifadəsinə verilmiş, elektirik xətti, təbii qaz xətti, içməli su xətti çəkilmiş və uzunluğu 9 km olan Dəliməmədli-Faxralı asfalt yolu salınmışdır. Qasım İsmayılov Rayon Partiya Komitəsinin üzvü (1963-1988), Azərbaycan və İttifaq kolxozçularının III, Azərbaycan KP-nın XXII, XXVI, XXVII qurultaylarının nümayəndəsi olmuş, XXVI-XXVII qurultaylarda Azərbaycan KP MK-nın üzvü seçilmişdir.

**“Lenin”** ordeni (1966), **“Lenin yubileyi”** medalı (1970), **“Oktyabr İnqilabı”** ordeni (1971), **“Ümumittifaq Xalq Təsərrüfatı Nailiyyətləri Sərgisinin”** bürünc medalı (1973), **“Qırmızı Əmək Bayrağı”** (1976) ordeni ilə təltif edilmişdir. Rəhpərlik etdiyi kolxoz dəfələrlə Azərbaycan KP MK-nın, AHİŞ-nin **“Keçici Qırmızı Bayrağını”** almışdır (1960-1975). Rayonda məktəb, məktəbdənkənar tərbiyyə müəssisələrinin tikintisində fərqləndiyinə görə **“Maarif əlaçısı“** döş nişanı ilə təltif edilmişdir. Beş övladı var.



**Musayev Qara Qasım oğlu** 26 okryabr 1926-cı ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. O, Kirovabad (indiki Gəncə) şəhərində pedoqoji və Bakı şəhərnidə Maliyyə Kredit Texnikumlarını bitirib. 1947-1951-ci illərdə Faxralı kənd ümumitəhsil məktəbində müəllim, 1951-1961-ci illərdə Faxralı kənd sovetinin katibi, 1961-1974-cü illərdə Faxralı kənd sovetinin sədri vəzifələrində işləyib. 1975-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun M.F.Axundov (Xınalı, Qaramusallı, Şıxlar kəndləri) adına kolxozuna idarə heyətinin sədri təyin edilib və həmin

vəzifədə 1980-ci ilə qədər işləyib. Qara müəllim sonralar K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda təsərrüfat briqadiri, iqtisadçı və s. vəzifələrdə işləyib. O, Kommunist Partiyasının üzvü olub. Hal-hazırda təqaüdçüdür. Səkkiz övladı var.



**Sadıqov Rafiq Salman oğlu** (Rəfail) 1946–cı ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1952-ci ildə Faxralı kənd orta məktəbinin birinci sinfinə daxil olub, 1962-ci ildə həmin məktəbin onuncu sinfini bitirdikdən sonra iki il Faxralı kənd K.Marks adına kolxozda kolxozçu işləyib. 1964-cü ildə Kirovabad (indiki Gəncə) şəhərində Azərbaycan Kənd Təsərrüfatı İnstitutuna daxil olub, 1969-cu ildə həmin İnstitutu bitirib və alim aqronom ixtisasına yiyələnib, Qasım İsmayılov rayonuna təyinat almışdır.

İyul 1969-cu ildən İyun 1970-ci ilədək Qasım İsmayılov (İndiki Goranboy) rayonunun Həzi Aslanov adına kolxozunda (Ağamalıoğlu kəndi) baş aqronom, İyun 1979-ci ildən sentyabr 1975-ci ilədək Qasım İsmayılov (indiki Goranboy) rayonunun Borsunlu kənd Oktyabr adına kolxozunda baş aqronom, sentyabr 1975-ci ildən fevral 1981-ci ilədək həmin kolxozda azad partiya komitəsinin katibi, fevral 1981-ci ildən aprel 1982-ci ilədək Qasım İsmayılov (İndiki Goranboy) rayonunda kənd təsərrüfatı idarəsinin baş aqronomu, aprel 1982-ci ildən, yanvar 1983-cü ilədək Faxralı kəndində Karl Marks adına kolxozda kolxoz idarə heyəti sədrinin müavini, fevral 1983-cü ildən, 1985-ci ilin fevralınadək Qasım İsmayılov (indiki Goranboy) rayonunun M.F. Axundov adına kolxozun idarə heyətinin sədri, fevral 1985-ci ildən yanvar 1986-cı ilədək Faxralı kəndində Karl Marks adına kolxozda pambıqçılıq briqadiri, yanvar 1986-cı ildən sentyabr 1993-cü ilədək Karl Marks adına kolxozda aqronom-hidrotexnik vəzifələrində işləyib. Sentyabr 1993-cü ildə Goranboy rayon İcra Hakimiyyəti başçısının Faxralı kəndində nümayəndəsi (kənd icra nümayəndəsi) təyin edilib və iyul 2000-ci ilədək həmin vəzifədə qüsursuz işləyərək səhhəti ilə əlaqədar öz ərizəsilə vəzifəsindən azad olunub. 2003-cü ildən dövlət qulluqçusu kimi təqaüdə çıxıb. Dörd övladı var.



**Vəliyev Cəlil Zülfaqar oğlu** 10 dekabr 1942-ci ildə Qasım İsmayılov rayonunun Faxralı kəndində anadan olmuşdur. Faxralı kənd orta məktəbini bitirdikdən (1948-1958) sonra, 1960-cı ildə Azərbaycan Kənd Təsərrüfatı Institutunun hazırlıq kursuna gedib. 1960-cı ildə Azərbaycan Kənd Təsərrüfatı Institutunun baytarlıq fakültəsinə qəbul olub və 1966-cı ildə həmin institutu baytar həkimi ixtisası üzrə bitirib. İnstitutu bitirdikdən sonra 1966-cı ildə təyinatla  Qasım İsmayılov rayonunun Sarov kəndi, "Azərbaycan" adına kolxozuna baytar həkim göndərilib. Qasım İsmayılov rayonunun Faxralı kəndi K.Marks adına kolxozunda qoyun fermasının müdiri (1971-1980), Qasım İsmayılov rayonunun Faxralı kəndi K.Marks adına kolxozunda kolxoz sədri (1980-1985), Qasım İsmayılov rayonunun Faxralı kəndi Karl Marks adına kolxozunda ferma müdiri (1985-1992), Qasım İsmayılov rayonunun Faxralı kəndi K.Marks adına kolxozunda kolxoz sədri və islahat komissiyasının sədri (1992-1998) vəzifələrində işləmişdir. O, iki dəfə Qasım İsmayılov rayonu Faxralı kəndi ZDS-nin deputatı olmuşdur (1975, 1982). 1954-1967-ci illərdə komsomol, 1969-1990-ci illərdə kommunist partiyasının üzvü olmuşdur. Qasım İsmayılov rayonunun Sarov kəndi "Azərbaycan" adına kolxozun həmkarlar təşkilatının sədri seçilib (1966, 1969). Rayon KP konfranslarının və 1981-ci ildə Ümumittifaq "Bilik" cəmiyyətinin üzvü olub.

1975-ci ildə **"IX Beşilliyin Zərbəçisi"** və 1978-ci ildə **"İttifaq Yığıncaqlarının Qalibi"** döş nişanları ilə və 1996-cı ildə "N" saylı hərbi hissəni himayədarlığa götürdüyünə görə **"Fəxri Fərmanla"** təltif olunub.

Səkkiz övladı var. 27.06.1999-cu ildə vəfat edib.



**Vəliyev Şikar Əliqara oğlu** 05.08.1949-cu ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1956-cı ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1966-cı ildə həmin məktəbin 10-cu sinfini bitirib. Orta məktəbi bitirdikdən sonra 1966-cı ildə Kirovabad (indiki Gəncə) şəhəri Azərbaycan Kənd Tə-

sərrüfatı İnstitutunun zootexnik fakültəsinə qəbul olub və 1971-ci ildə həmin institutu zootexnik ixtisas üzrə bitirib. Şikar müəllim 1971-ci ildə hərbi xidmətə çağrılıb və Estoniya Respublikasının Tallin şəhərində HHM qoşunlarında xidmət edib. Elə həmin ildə o, zabit kursu oxumağa göndərilib, tam kurs keçdikdən sonra isə ona leytenant rütbəsi təqdim edilib. 1972-ci ildə ordudan tərxis olduqdan sonra Qasım İsmayılov (indiki Goranboy) rayonunun Tapqaraqoyunlu kəndinə zootexnik təyin edilib. 1973-cü ildə Faxralı kəndində zootexnik, 1974-cü ildə 1977-ci ilə kimi Qasım İsmayılov (indiki Goranboy) rayonunun Tədarük İdarəsində yun tədarükü üzrə əmtəəşünas və qəbulçu, 1977-ci ildə 1987-ci ilə kimi Faxralı kəndində zootexnik, 1987-ci ildə K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda sədr müavini, 1988-ci ildə isə həmin kolxozun sədri və 1992-ci ildə İslahat Komissiyasının sədr müavini vəzifələrində işləyib. 1995-ci ildən hal-hazıra kimi fərdi təsərrüfatla məşğuldur. K.Marks adına kolxozda rəhbərliyi dövründə kolxozun 1 saylı briqadası 1988-ci ildə taxılçılıq sahəsi üzrə göstərdiyi yüksək göstəricilərə görə SSRİ Xalq Təsərrüfatları Nailiyyətləri Sərgisinin diplomu ilə təltif olunub. Dörd övladı var.



**Yusifov Əbdülrəhman Məhyəddin oğlu** 1905-ci ildə Faxralı kəndində anadan olub. 1936-cı ildə Gürcüstandakı 26 Bakı Komissarı adına Ali Partiya məktəbini bitirib. Şamaxı rayon Partiya Komitəsinin şöbə müdiri və katibi (1937-1938), Şamaxı rayon Partiya Komitəsinin ikinci katibi (1939), Qasım İsmayılov rayon Partiya Komitəsinin katibi (1940-1942) vəzifələrində və 1943-cü ildən sonra müxtəlif təsərrüfatlarda işləyib. Yeddi övladı var. 1977-ci ildə vəfat edib.

# ELM XADİMLƏRİ



**Həmidov Afəddin Vahid oğlu** 1955-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirdikdən (1962-1972) sonra, S. Ağamalıoğlu adına "Şərəf nişanı" ordenli Azərbaycan Kənd Təsərrüfatı İnstitunun (indiki ADAU) iqtisadiyyat fakültəsinə qəbul olmuş, 1977-ci ildə həmin ali təhsil ocağını "Fərqlənmə" diplomu ilə bitirərək kənd təssərüfatı istehsalı iqtisadçı-təşkilatçı ixtisasına yiyələnmişdir. Əmək fəaliyyətinə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Kolxozlararası Kökəltmə Birliyində hesabdar (1977-1978) kimi başlayıb. Gəncə şəhər 1 saylı Yol-Tikinti idarəsində hesabdar-xəzinədar (1978-1980), Gəncə şəhər 1 saylı Birləşmiş Doğum Evində böyük mühasib (1980-1981), Gəncə Alüminium zavodunda iqtisadçı-mühəndis (1981-1984) vəzifələrində işləyib.

1984-cü ildə müsabiqə yolu ilə ADAU-nun kənd təsərrüffatı istehsalının təşkili kafedrasına assistent vəzifəsinə qəbul olunub. 2003-2009-cu illərdə aqrar iqtisadiyyat və menecment fakültəsinin dekan müavini vəzifəsində işləyib. Hal hazırda ADAU-nun aqrobiznesin təşkili və idarə edilməsi kofedrasında dosentdir.

1991-ci ildə "Yeni təsərrüfatçılıq şəraitində kənd təsərrüfatında təsərrüfat hesabının təkmilləşdirilməsi" mövzusunda (Azərbaycan Respublikasının sovxozları timsalında) elmi işini yekunlaşdıraraq müdafiə etmiş, iqtisad elmləri namizədi alimlik dərəcəsinə layiq görülmüşdür. Kəndli fermer təsərrüfatlarının yaradılması ilə bağlı səmərəli təklifləri hazırda ölkəmizdə müvəffəqiyyətlə həyata keçrilir. 30-a yaxın elmi və metodiki əsərlərin müəllifidir. İki övladı var.



**İbrahimov Kamil Cəlal oğlu** 25 iyun 1956-cı il tarixində Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1973-cü ildə Faxralı kənd orta məktəbini bitirib və həmin il Azərbaycan Neft və Kimya institutunun (indiki ADNA) Energetika fakültəsinə daxil olub. 1978-ci ildə institutunu bitirərək "Sənaye istilik energetikası" ixtisasına yiyələnmib. 1978-1980-ci illərdə "Azərenerjisazlama" müəssisəsində mühəndis vəzifəsində işləyib.

1980-ci ildə Azərbaycan Mühəndis-İnşaat institutuna (indiki Memarlıq və İnşaat Universiteti) dəvət olunub və 2003-cü ilədək həmin institutun "İstilik təchizatı və istilik texnikası" kafedrasında elmi-pedaqoji fəaliyyət göstərib. 1992-ci ildə "Suyun duzsuzlaşdırılmasının və yumşaldılmasının kombinə edilmiş hasilatının səmərəli üsullarının işlənməsi və tədqiqi" mövzusunda dissertasiya müdafiə edərək texnika elmləri namizədi elmi dərəcəsi alıb. 50-yə yaxın elmi əsərin və 1 ixtiranının müəllifidir. Elmi fəaliyyətinin əsas istiqamətini suyun öz tərkibində olan ionlardan istifadə edərək onun emalı prosesinin iqtisadi və ekoloji səmərəsinin yüksəldilməsi təşkil edir. Elmi nəailiyyətlərini mütəmadi olaraq İttifaqın nüfüzlü jurnallarında ("Energetik", "Promışlennaya Teploenergetika", "Ximiya i texnologiya vodı", "Problemı Energetiki" və b.) dərc etdirib və elmi-texniki konfranslarda, seminarlarda və iki Beynəlxalq simpoziumda məruzələr edib.

O, elmi nəticələrinin Respublika daxilində (Azərbaycan DRES-i, Bakı İEM-1, Gəncə İEM-i), ondan kənarda (Tümenenerji, Başkirenerji, Qorki avtomobil zavodu, Qroznı İEM-i və b.) müvəffəqiyyətli sınağına və istehsalatda tətbiqinə nail olmuşdur.

Onun elmi tədqiqatları və işlədiyi texnologiyalardan Moskvada "Metodiçeskoye ukazaniye po proektirovaniyu TES s maksimalno sokraşennımi stokami" normativ sənədinin hazırlanmasında, Elabuqa avtomobil zavodunun və Novosibirsk İEM-2-nin su hazırlama sxemlərinin işlənilməsində istifadə edilib.

2003-cü ildən etibarən Azərbaycan Respublikası Dövlət Neft Şirkətinin (ARDNŞ) "Neftqazelmitədqiqatlayihə" institutunda

layihənin baş mühəndisi vəzifəsində işləyir. Müasir “İstilik-qaz təchizatı, ventilyasysiya və havanın kondisiyalaşdırılması” sistemlərinin layihələndirilməsi ilə məşğuldur. Onun iştirakı ilə Lənkəran “Müalicə və Diaqnostika Mərkəzi”, “Əli-Bayramlı (indiki Şirvan) şəhər stadionu”, “Azərbaycan” nəşriyyatı, “Ümid” yatağında stasionar dəniz platforması və b. mühüm əhəmiyyətli layihələr yerinə yetirilib. Üç övladı var.



**Mustafayev Rahib Qasım oğlu** 1927-ci ildə Faxralı kəndində anadan olmuşdur. Faxralı kənd yeddiillik məktəbini bitirdikdən sonra Bakı Dəmiryol Texnikumuna qəbul olub və oranı “daşınma təsərrüfatı” ixtisası üzrə bitirimişdir (1943-1947). 1946-cı ildə Ümumittifaq Lenin Kommunist Gənclər Təşkilatına üzv qəbul edilib. 1948-ci ildə S.M. Kirov adına Azərbaycan Dövlət Universitetinin Tarix fakültəsinə qəbul olmuş və 1953-cü ildə oranı “Fəlsəfə” ixtisası üzrə bitirmişdir. 1953-cü ildə Qasım İsmayılov rayonunun Ağamalıoğlu kənd orta məktəbində tarix və coğrafiya müəllimi kimi fəaliyyətə başlayıb. 1956-cı ildə Sovet İttifaqı Kommunist Partiyasına üzv qəbul edilib. Qasım İsmayılov rayonunun Faxralı kənd orta məktəbində dərs hissə müdiri və tarix müəllimi (1954-1958), Dəliməmmədli qəsəbəsi orta məktəbində direktor (1958-1962) vəzifələrində işləyib. 1962-ci ildə aspiranturaya qəbul olub və 1965-ci ildə ona ehtiyatda olan “leytenant” zabit rütbəsi verilib. 1969-cu ildə 26 martda Azərbaycan Dövlət Universititetində elmi işini müdafiə etmiş və ona fəlsəfə elmləri namizədi alimlik dərəcəsi verilmişdir. 1972-ci ildə H.Zərdabi adına Kirovabad Pedaqoji İnstitunda dosent işləyib. 1973-cü ildə SSRİ Elmlər Akademiyasının Fəlsəfə cəmiyyətinin üzvü seçilib. 1975-1976-cı illərdə Özbəkistan Respublikası Daşkənd Dövlət Universitetində ixtisasartırma kursu keçib. 1977-ci ildə ehtiyatda olan “baş leytenant” zabit rütbəsi alıb. 1982-ci ildən Azərbaycan Respublikası Texnologiya İnstitutunda müəllim işləyib. Bir çox elmi fəlsəfi məqalələr yazaraq fəlsəfəyə aid öz tövsüyyələrini tələbələrinə və dinləyicilərinə vermişdir.

1974-cü ildə **“Sosialist Yığıncağının Qələbəsi 1973”** döş nisanı ilə təltif olunmuşdur. Dörd övladı var. 2005-ci ildə vəfat edib.



**Sadıqov Əlövsət Həsən oğlu** biologiya elimləri namizədi. 30 mart 1941-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1948-ci ildə Faxralı kənd orta məktəbin 1-ci sinfinə gedib və 1958-ci ildə həmin məktəbin 10-cu sinfini bitirərək S.Ağamalı oğlu adına Azərbaycan Kənd Təsərrüfatı İnstitutuna (indiki ADAU) qəbul olub. S.Ağamalı oğlu adına Azərbaycan Kənd Təsərrüfatı İnstitutunu (indiki ADAU) bitirib (1965), Qasım İsmayılov rayonunun Dmitrov adına kolxozunda baş aqronom, rayon kənd təsərrüfatı idarəsində böyük aqronom, kolxoz həmkarlar təşkilatının sədri (1965-1968) işləyib, Azərbaycan SSR EA Genetika və Seleksiya İnstitutunun aspirantı olub (1969-1971).

Akademik İ.K.Abdullayevin rəhbərliyi ilə Qusarcay ZTS-də tutun eksperimental poliploidiyası üzrə tədqiqatlar aparmış, Gənc Alimlər Şurasının sədr müavini olub, Azərbaycan Elmi-Tədqiqat İpəkcilik İnstitutunda elmi katib (1972-1990) işləyib, 1990-cı ildən həmin institutda Tutçuluq şöbəsinə rəhbərlik edir. 1976-cı ildə dissertasiya işini müdafiə etmiş biolgiya elimlər namizədi alimlik dərəcəsini və 1980-ci ildə isə genetika ixtisası üzrə böyük elmi işçi dosent alimlik rütbəsi almışdır. O, 1985-ci ildə SSRİ Kənd Təsərrüfatı Nazirliyi yanında Aqrar Sənaye Komplekslərinin İdarə edilməsi ali məktəbini bitirib. 100-dən artıq elmi əsərin, xeyli qazet məqalələrinin, o cümlədən 2008-ci ildə işıq üzü görmüş "Azərbaycanın Yemlik Seleksiya Tut Sortları" kitabının və eləcə də yeni yaradılmış Baxçatut sortunun müəllifidir. Çoxillik tədqiqatlar nəticəsində tut bitkisinin xeyli müxtəlif ploidli, perspektivli formalarını yetişdirib, onun iştirakı və rəhbərliyi ilə tutun yeni, daha çox yarpaq, barama və xam ipək məhsulu almağa imkan verən, Nəsrəddintut, Kamiltut, Füzulitut, Yunistut, Faxralıtut, Larisatut, Adilətut, Zümrüdtut, Nağıtut, Qədirtut, Lətifətut və Aminətut sortları yaradılmış və gələcək rayonlaşdırma məqsədilə Azərbaycan respublikası "Seleksiya nailiyyətlərinin sınağı və mühafizə üzrə Dövlət komissiyası"na sınaq üçün təqdim edilib və qəbul olunub. O, ipəkçilikdə yem bazasını möhkəmləndirmək məqsədilə yüksək məhsuldar triploid nəsil verən Pobeda 4x x Yaqubtut 2x və Sıxgöztut

2x x 1-15/18 4x hibrid kombinasiyalarını seçib və respublikada tətbiq etmək üçün Kənd Təsərrüfatı Nazirliyinə tövsiyələr təqdim etib.

Əlövsət müəllim elmi nailiyyətlərin təbliğinə xüsusi diqqət yetirir. Belə ki, ümumittifaq simpoziumlarında (1972, 1977), II Sovet Hindistan simpoziumunda (1976), Ümumittifaq Genetiqlər və Seleksiyaçılar Cəmiyyətinin qurultaylarında (1977-1987), 1991 və 1993-cü illərdə ipəkçilik üzrə keçrilmiş beynəlxalq konqreslərdə, 2006-cı ildə "Biomüxtəlifliyin genetik ehtiyatları" üzrə I Beynəlxalq Elmi Konfransda, 2007-ci ildə "Azərbaycanda bitki seleksiyası və kənd təsərrüfatı biotexnologiyası sahəsində potensialın qiymətləndirilməsi və onun yaxşılaşdırılması üçün strategiyanın hazırlanması" mövzusunda keçirilən Beynəlxalq seminarda, eləcə də Beynəlxalq, Ümumittifaq, Zaqafqaziya, respublika və rayon konfranslarının iştirakçısı olub, məruzələrlə çıxış etmişdir. Əlövsət müəllim AzETTİ-nin elmi və metodiki şuralarının, ekspert, attestasiya, müsabiqə, aspiranturaya qəbul komissiyalarının, institutun əsərlərinin buraxılması üzrə redaksiya heyyətinin üzvü, aspirantura şöbəsinin, məxfi bölmənin müdiri, hərbi uçot və bron-laşdırma üzrə məsul şəxs və s. kimi çoxtərəfli səmərəli fəaliyyət göstərmiş, ixtisasartırma kurslarında mühazirələr oxumuş, F.Məlikov adına Azərbaycan Elmi-Tədqiqat Heyvandarlıq İnstitutunda (06.02.01) ixtisası üzrə təşkil edilmiş müdafiə şurasının üzvü olmuşdur. Onun elmi rəhbərliyi ilə bir aspirantı k.t.e.n. alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə etmiş, təsdiqini almış və hal-hazırda Gəncə Dövlət Universitetində dosent işləyir. 1968-ci ildən Sovet İttifaqı Kommunist Partiyasının üzvü olub. Hal-hazırda Yeni Azərbaycan Partiyasının üzvüdür. O, 1974-1978-ci illərin **"Sosialist Yarışmasının Qalibi"**, X və XI **"Beşilliklərin zərbəçisi"** döş nişanları ilə təltif edilib. Üç övladı var.

# TƏHSİL İŞÇİLƏRİ



**Abdullayeva Qətibə İmamqulu qızı** 16 sentyabr 1950-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi qurtardıqdan sonra H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və həmin institutun "Azərbaycan dili və ədəbiyyatı" ixtisasını bitirib (1969-1973). 1973-cü ildən hal-hazıra kimi Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində Azərbaycan dili və ədəbiyyatı fənnlərindən dərs deyir. Sinif rəhbəri işləyir. Üç övladı var.



**Abdullayeva Mənzərə İmamqulu qızı** 04 sentyabr 1948-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi qurtardıqdan sonra H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və oranın "Ibtidai təhsilin pedaqoqikası və metodikası" ixtisasının qiyabi şöbəsini bitirib (1967-1972). 1969-cu ildən hal-hazıra kimi Goranboy rayon T.Sadıqov adına Faxralı kənd orta məktəbində sinif müəllimi işləyir. Beş övladı var.



**Çobanzadə Nataşa Oruc** qızı 23 sentyabr 1938-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirib (1947-1957). Məktəbi bitirdikdən sonra K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda kolxoçu olub. 1960-cı ildə Faxralı kənd orta məktəbində pioner baş dəstə rəhbəri işləyib və 1960-cı ilin iyun ayında H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun kimya-biologiya və kənd təsərrüfatının əsasları fakültəsinə qiyabi qəbul olub və 1966-cı ildə həmin institutu biologiya ixtisası üzrə bitirib. Nataşa müəllim Faxralı kəndində ali

məktəbə qəbul olan ilk qadındır. 1964-cü ildə Faxralı kənd orta məktəbində biologiya fənni üzrə müəllim kimi fəaliyyətə başlayan Nataşa müəllim 1966-cı ildən 1981-ci ilə kimi Faxralı kənd orta məktəbində direktorun təşkilat işləri üzrə müavini və 1981-ci ildən 1997-ci ilə kimi Faxralı kənd orta məktəbinin direktoru vəzifələrində işləyib. 1997-ci ildən hal-hazıra kimi müəllim işləyir. 1978-1981-ci illərdə Faxralı kənd orta məktəbinin ilk partiya təşkilatının katibi olub, 1985-ci ildə Faxralı kəndindən rayonsovetinə deputat seçilib və 1992-ci ilə kimi kəndin deputatı olub və bir sıra içtimai vəzifələrdə çalışıb. Hazırda təqaüdçü və müəllimdir. Beş övladı var.



**Babayev Fidail Bəhlul oğlu** 1935-cü ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirib (1945-1955). Məktəbi bitirdikdən sonra K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda kolxozçu işləyib. 1965-ci ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və 1970-ci ildə oranın biologiya fakültəsini bitirib. 1970-ci ildən hal hazıra kimi Faxralı kənd orta məktəbində biologiya fənni üzrə müəllim işləyir. Fidail müəllimin dərs dediyi və yetirdiyi şagirdlər müxtəlif ali məktəbləri yüksək ixtisaslar üzrə bitirərək yaxşı əxlaqi keyfiyyətlərə malik olmuşlar.



**Bayramova Şahizər Bayram qızı** 1950-ci ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirib (1957-1967). 1968-ci ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və 1974-ci ildə oranın dil-ədəbiyyat fakültəsini bitirib. 1971-ci ildən hal hazıra kimi Faxralı kənd orta məktəbində müəllim işləyir. Dörd övladı var.



**Binnətova Həqiqət Türmən qızı** 09.1943-cü ildə Qazax rayonunda anadan olub. 1950-ci ildə məktəbin 1-ci sinfinə gedib və 1960-cı ildə orta məktəbin 10-cu sinfini bitirib. 1962-ci ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və 1966-cı ildə həmin institutun "ibtidai təhsilin pedaqoqikası və metodikası" ixtisası üzrə bitirərək təyinatla Qasım İsmayılaov (indiki Goranboy) rayonunun Faxralı kənd orta məktəbinə müəllim göndərilib. Həmin vaxtdan Faxralıda ailə qurub yaşayır. Hal-hazırda Faxralı kənd orta məktəbində ibtidai sinif müəllimi işləyir. İki övladı var.



**Daşıyev Fəxrəddin Əli oğlu** 1934-cü ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olmuşdur. Faxralı kənd yeddiillik məktəbindən (1944-1951) sonra 1954-cü ildə Ağamalıoğlu kənd orta məktəbinin 10-cu sinifini bitirib. Bir il pioner baş dəstə rəhbəri işlədikdən sonra H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Dövlət Pedaqoji İnstitutuna qəbul olmuş və oranın fizika-riyaziyyat fakültəsini bitirmişdir (1955-1960). Faxralı kənd orta məktəbində müəllim (1960-1967), məktəb direktoru (1967-1973), müəllim (1973-1978), məktəb direktoru (1978, 1980, 1998), Faxralı kənd soveti sədri və müəllim vəzifələrində işləmişdir.

1988-ci ildə Əmək Veteranı adına layiq görülüb və 2005-ci ilin aprel ayında **"Fəxri Fərman"**la təltif edilib. Yeddi övladı var. 2005-ci ildə vəfat edib.

**Əfəndiyeva Ədibə Mürsəl qızı** Faxralı kəndində anadan olub. Ədibə müəllim həyat yoldaşı Yaqub müəllim kimi maarif fədaisi olub. O, da Faxralı məktəbinin təsisçilərindən olub. Ədibə müəllim Sidqinin bu kəlamını şagirdlərinə tez-tez sitat gətirərmiş: "Bizləri nadanlıq zülmətindən qurtarıb nuri mərifətə yetirən məktəbdir". Ədibə müəllim təhsildə göstərdiyi xidmətlərə görə **"Şöhrət"** ordeni və medallarla təltif olunub. Altı övladı var. 1973-cü ildə vəfat edib.



**Əfəndiyev Yaqub Abdulla oğlu** 1890-cı ildə Faxralı kəndində anadan olub. Faxralı kəndində ilk yeni tipli məktəbin banisidir. O, 1919-cu ildə fərdi məktəb açmış, təhsilə marağı olanları məktəbə cəlb etmişdir. Məktəb avadanlıqlarını başqa yerlərdən əldə etmişdir. Əvvəllər ibtidai məktəb olan bu təhsil ocağı, sonralar yeddillik məktəbə çevrilmişdir. Yaqub müəllim bu məktəbdə müəllim, dərs hissə müdiri və direktor işləmişdir. Yaqub müəllim maarif sahəsin-dəki xidmətlərinə görə **"Lenin"** ordeni və müxtəlif medallarla təltif olunmuşdur. Altı övladı var. 1967-ci ildə vəfat edib.



**Əhmədova Afaq Mehrab qızı** 28 avqust 1965-ci ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi bitirib H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun riyaziyyat fakültəsinə qəbul olub və riyaziyyat ixtisası uzrə həmin institutu bitirib (1983-1988). Müəllim kimi əmək fəaliyyətinə başlayıb (1983). Hal-hazırda Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində riyaziyyat müəllimi və direktorun sinifdənxaric və məktəbdənkənar tərbiyəvi işləri üzrə müavini vəzifəsində işləyir. Üç övladı var.



**Əhmədov Amil Zamaləddin oğlu** 1983-cü ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi qurtarandan sonra Bakı Dövlət Universitetinə qəbul olub və oranın kimya fakültəsini bitirib (2001-2005). Hərbi xidmət keçdikdən sonra (2005-2006) Gəncə Gil Torpaq İstehsalat sahəsinin mərkəzi kimya laboratoriyasında işləyib (2007-2010). 2010-cu ildən Goranboy rayonunun Faxralı kənd T.Sadıqov adına orta məktəbində müəllim işləyir. Amil müəllim eyni zamanda şagirdlərin ali məktəblərə qəbulu üçün test

imtahanlarına hazırlaşmalarına kimya-biologiya fənlərindən köməklik edir.



**Əhmədova Fatma Xanlar qızı** 01 yanvar 1946-cı ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1953-cü ildə Faxralı kəndində 1-ci sinfə gedib və 1963-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1964-cü ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və 1967-ci ildə oranın "ibtidai təhsilin pedaqoqikası və metodikası" ixtisası üzrə tam kursunu bitirib. 1967-ci ildə institutun təyinatına əsasən Faxralı kənd orta məktəbinə müəllim təyin edilib. İşlədiyi müddətdə heç bir töhmət almayıb. Hal-hazırda Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində ibtidai sinif müəllimidir. Səkkiz övladı var.



**Əhmədova Xatirə Tapdıq qızı** 23 sentyabr 1963-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1970-ci ildə Faxralı kəndində 1-ci sinfə gedib və 1980-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1980-1982-ci illərdə K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda işləyib. 1982-ci ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və 1986-cı ildə oranın "ibtidai təhsilin pedaqoqikası və metodikası" ixtisası üzrə tam kursunu bitirib. 1987-ci ildən Quşçular kəndində müəllim kimi əmək fəaliyyətinə başlayıb. Hal-hazırda Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində ibtidai sinif müəllimidir. İki övladı var.



**Əhmədova Leyla Əliaslan qızı** 26 dekabr 1946acı ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1955-cü ildə Faxralı kəndində 1-ci sinfə gedib və 1965-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1965-ci ildə V. İ. Lenin adına Azərbaycan Dövlət Pedaqoji Institutuna daxil olub və 1969-cu ildə həmin institutun biologiya ixtisası üzrə tam kursunu bitirib. 1969-cu ildən Azərbaycan CCP Maarif Nazirliyinin azad təyinatına əsasən Faxralı kənd orta məktəbinə biologiya müəllimi təyin edilib. İşlədiyi müddətdə heç bir töhmət almayıb. Bir çox fənn olimpiadalarında iştirak edib və diplomlar alıb. Hal-hazırda Goranboy rayonunun T. Sadıqov adına Faxralı kənd orta məktəbində biologiya müəllimi işləyir. Beş övladı var.



**Əliyev Namiq Məhəmməd oğlu** 15 avqust 1949-cu ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi bitirib H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun "İbtidai təhsilin pedaqoqikası və metodikası" ixtisasına qəbul olub və həmin institutu qiyabi bitirib (1967-1972). Qurbanzadə kənd səkkizillik məktəbində müəllim kimi fəaliyyətə başlayıb (1969-1976). 1973-cü ildə birillik hərbi kurs keçib və leytenant rütbəsi alıb. Qasım İsmayılov rayonunun K.Marks adına kolxozunda briqadir işləyib (1976-1988). 1988-ci ildən hal-hazıra kimi Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində hərbi müəllim işləyir. İstefada olan kapitandır. Dörd övladı var.



**Hacıyeva Seyda Qulam qızı** 01 oktyabr 1955-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1962-ci ildə Faxralı kənd orta məktəbində 1-ci sinfə gedib və 1972-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1972-ci ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və 1976-cı ildə oranın kimya

biologiya fakültəsini bitirib. 1976-cı ildə institutun təyinatına əsasən Faxralı kənd orta məktəbinə müəllim təyin edilib. Hal-hazırda Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində kimya fənni üzrə müəllimdir. Üç övladı var.



**Hacıyeva Zümrüd Məmməd qızı** 1936-cı ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1945-ci ildə Kirovabad şəhəri 21 saylı məktəbin I sinfinə gedib və 1949-cu ildə həmin məktəbin 6-cı sinfini bitirib. 1949-cu ilin sentyabr ayında Faxralı kənd 7 illik məktəbinin V sinfinə daxil olub, 1952-ci ildə həmin məktəbin VII sinfini bitirib. K. Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda kolxozçu işləyib (1952-1954). 1954-cü ilin sentyabr ayında Faxralı kənd orta məktəbinin VIII sinfində oxumağını davam etdirib və 1957-ci ildə X sinfi bitirib, yenidən K. Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda kolxozçu işləyib (1957-1961). H.Zərdabi adına Kirovabad Pedaqoji İnstitutunun "ibtidai təhsilin pedaqoqikası və metodikası" ixtisası üzrə tam kursunu bitirib (1961-1968). 1961-ci ildən hal-hazıra kimi Faxralı kənd orta məktəbində sinif müəllimi işləyir. 15 sentyabr 1989-cu ildə **"Əmək veteranı"** medalı ilə təltif olunub. Yeddi övladı var.



**Həsənova İradə Nəsir qızı** 26 oktyabr 1955-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1962-ci ildə Faxralı kəndində 1-ci sinfə gedib və 1972-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1973-cü ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və 1977-ci ildə oranın tarix fakültəsini bitirib. 1977-ci ildən müəllim işləyir. Hal-hazırda Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində tarix fənni üzrə müəllimdir. Dörd övladı var.



**Həsənova Nəzifə Həsən qızı** 26 sentyabr 1973-cü ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi bitirib Gəncə Dövlət Pedaqoji İnstitutunun Psixolgiya ixtisasına qəbul olub və həmin ixtisas üzrə institutu bitirib (1993-1998). 1998-ci ildə müəllim kimi əmək fəaliyyətinə başlayıb. Hal-hazırda Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində müəllim və psixoloq işləyir. İki övladı var.



**Hüseynov Yusif Kamil oğlu** 09 noyabr 1941-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirdikdən sonra (1949-1959) Kirovabad (indiki Gəncə) şəhəri Yüngül Sənaye Texnikumunun "pambıqçı" ixtisasını qurtarıb (1959-1961). 1966-cı ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun riyaziyyat fakültəsinə qiyabi qəbul olub və 1971-ci ildə oranı bitirib. Əlibayramlı (indiki Şirvan) rayonu pambıq zavodunda çilingər (1961-1964), Qasım İsmayılov rayonunun Dəliməmmədli qəsbəsi pambıq zavodunda anbardar, çilingər (1964-1968), Qasım İsmayılov rayonunun Qurbanzadə kənd səkkizillik məktəbində müəllim (1968-1996) və Qasım İsmayılov rayonunun Qurbanzadə kənd gecə məktəbində direktor (1970-1972) (bu təhsil ocağında dərsdən yayınanlara və gündüz dərslərə gəlməyənlərə gecələr təhsil verirmişlər) vəzifələrində işləyib. 1996-cı ildən iş stajına görə təqaüddədir. Altı övladı var.



**Xoyluyev İbrahim Mustafa oğlu** 1940-cı ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olmuşdur. H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunu "ibtidai təhsilin pedaqoqikası və metodikası" ixtisası üzrə bitirmişdir (1962-1966). Qasim İsmayılov rayonunun Dəliməmmədli

qəsəbəsi texniki peşə təhsili məktəbində musiqi dərsi deyib və Faxralı kənd orta məktəbində sinif müəllimi işləyibmiş (1966-1972). Deyilənlərə görə həvəskar şeir yazan olub, təəssüf ki, yazdıqlarından günümüzə qalmayıb. 1972-ci ildə ölümün caynağında Allahın dərgahına qovuşub. İki övladı var.



**İbrahimova Afət Həbib qızı** 08 noyabr 1950-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1958-ci ildə Faxralı kənd orta məktəbində 1-ci sinfə gedib və 1968-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1968-ci ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və 1972-ci ildə oranın "ibtidai təhsilin pedaqoqikası və metodikası" ixtisası üzrə tam kursunu bitirib. 1972-cü ildə institutun təyinatına əsasən Faxralı kənd orta məktəbinə müəllim təyin edilib. Hal-hazırda Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində ibtidai sinif müəllimidir. Beş övladı var.



**İbrahimova Məleykə Cəmil qızı** 1946-cı ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1953-cü ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1963-cü ildə həmin məktəbin onuncu sinfini bitirib. 1964-cü ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitunun "ibtidai təhsilin pedaqoqikası və metodikası" fakültəsinə qəbul olub və 1968-ci ildə həmin institutu bitirib. Təyinatla həmin ildən Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndinə müəllim təyin olunub. Hal-hazırda da T.Sadıqov adına Faxralı kənd orta məktəbində müəllim işləyir. Beş övladı var.



**İmanov Rafil Calal oğlu** 12 noyabr 1949-cu ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1966-cı ildə Goranboy rayonunun Faxralı kənd orta məktəbini bitirib. 1970-ci ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun riyaziyyat fakültəsini bitirib və 1970-1977-ci illərdə Balakən rayo-nunda müəllim işləyib. 1978-ci ildən Bakı şəhərinin 116, 48, 245 və 287 saylı orta məktəblərində riyaziyyat müəllimi və Xətai rayonunun təhsil şöbəsinin müdiri vəzifəsində işləyib. 1991-1992-ci ildə gələcək zəkalar məktəbini yaratmışdır (indi 287 saylı Zəkalar litseyi). 1982-ci ildən test metodikasını tətbiq etməyə başlamışdır. Hər il Rafil müəllimin şagirdləri riyaziyyat fənni olimpiadası üzrə rayon, şəhər və Respublika turlarında uğurla çıxış edirlər. Rafil müəllimin sinfini qurtaran şagirdlər hər il 90-100% ali məktəbə daxil olur. Metodist və ali kateqoriyalı müəllimdir. 1992-2001-ci ildə TQDK-da ekspert olub. 20-dən artıq elmi-metodik məqalənin müəllifidir. İlin müəllimi və pedaqoji mühazirənin qalibi olub. Beş övladı var.



**İsmayılov Bəxtiyar Möhtəşəm oğlu** 08 iyul 1981-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra Gəncə Dövlət Pedaqoji Universitetinə qəbul olub və həmin universitetin “Kimya” ixtisasını qurtarıb (1999-2003). Əmək fəaliyyətinə kimya müəllimi kimi başlayıb (2004-2007). 2007-ci ildən hal-hazıra kimi Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində direktor vəzifəsində işləyir və həmin məktədə kimya fənnini tədris edir.



**İsmayılova Cəmilə Möhtəşəm qızı** 09 yanvar 1971-ci ildə Qasım ismayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1978-ci ildə Faxralı kəndində 1-ci sinfə gedib və 1988-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. Orta məktəbi bitirdikdən sonra K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda işləyib. 1990-cı ildə Azərbaycan Pedaqoji Rus dili və Ədəbiyyat İnstitutuna qəbul olub və oranın 1995-ci ildə rus dili və ədəbiyyat fakültəsini bitirib. 1995-ci ildə institutun təyinatına əsasən Faxralı kənd orta məktəbinə müəllim təyin edilmişdir. Hal-hazırda Goranboy rayonunun T. Sadıqov adına Faxralı kənd orta məktəbində rus dili fənni üzrə müəllimdir.



**İsmayılov Əsəd Yusif oğlu** 1921-ci ildə Faxralı kəndində anadan olmuşdur. Faxralı kənd yeddiilik məktəbini bitirmişdir. Böyük Vətən müharibəsində iştirak etmişdir. O, 1942-1943-cü illərdə Şimali Qafqaz cəbhəsində atıçı kimi döyüşlərdə vuruşub. 1943-cü ildə döyüşlərin birində mərmi partlayışı zamanı sağ ayağından qəlpə yarası alaraq hospitala yerləşdirilib. Yara ağır olduğundan Əsəd müəllim yenidən döyüşlərə qatıla bilməyib və hospitaldan da tərxis olunub. Hərbi xidmətdən qayıtdıqdan sonra bir müddət yaralarının sağalması ilə məşğul olub və müalicələr alıb. 1946-cı ildə Əsəd müəllim Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun dil-ədəbiyyat fakültəsinə qəbul olunmuş və 1950-ci ildə həmin institutu dil-ədəbiyyat müəllimi ixtisası üzrə bitirmişdir. Ali təhsil aldıqdan sonra Faxralı kənd orta məktəbində az bir müddət ərzində müəllim işləmiş və 1951-ci ildə Qasım İsmayılaov (indiki Goranboy) rayonunun Əzizbəyov kənd orta məktəbinə direktor göndərilmişdir. 1953-cü ildə ona leytenant rütbəsi verilmişdir. Elə həmin ildə yəni, 1953-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Tapqaraqoyunlu kənd məktəbinə müəllim göndərilib. 1956-cı ilə kimi orada işləyən Əsəd müəllim Faxralı kənd orta məktəbinə yenidən müəllim göndərilmiş və 1962-ci ildən 1967-ci ilə kimi Faxralı kənd orta məktəbində direktor işləmişdir. 1957-ci ildə Faxralı kənd sovetinin deputatı seçilib. O, 1967-ci ildən 1981-ci ilə

kimi Kirovabad (indiki Gəncə) şəhərinin 40 saylı məktəbində müəllim və dərs hissə müdiri kimi fəaliyyət göstərmişdir.
**“Böyük Vətən Müharibəsi Qələbəsinin 20 illiyi”** (1965), **“Böyük Vətən Müharibəsi Qələbəsinin 25 illiyi”** (1970), **“Böyük Vətən Müharibəsi Qələbəsinin 30 illiyi”** (1975), **“Əmək Veteranı”** (1981) medalları ilə təltif edilib. 26 noyabr 1981-ci ildə vəfat edib.

**İsmayılov Həsən Hüseyn oğlu** 1937-ci ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd yeddiillik məktəbindən (1946-1953) sonra Dəliməmmədli qəsəbəsində II buraxılış olaraq orta məktəbin onuncu sinfini başa vurmuşdur. Bir müddət K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda kolxozçu işlədikdən sonra 1962-ci ildə H. Zərdabi adına Kirovabad (indiki Gəncə) Dövlət Pedaqoji İnstitutuna qəbul olmuş və 1967-ci ildə oranın riyaziyyat fakültəsini bitirmişdir. Faxralı kənd orta məktəbində riyaziyyat müəllim işləyib (1967-2007). Altı övladı var. 2007-ci ildə vəfat edib.



**İsmayılov Möhtəşəm Ağalar oğlu** 08 oktyabr 1940-cı ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi bitirib Azərbaycan Pedaqoji İnstitutunun riyaziyyat ixtisasına qəbul olub və həmin ixtisas üzrə institutu qurtarıb (1962-1967). 1967-ci ildən İmişli rayonunda riyaziyyat müəllimi kimi fəaliyyətə başlayıb. 1969-cu ildən 1998-ci ilə kimi Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində riyaziyyat müəllimi və sinif rəhbəri işləyib. 1998-2000-ci illərdə həmin məktəbin direktoru olub və 2000-ci ildən hal-hazıra kimi riyaziyyat müəllimi işləyir. Beş övladı var.



**İsmayılova Tofiqə İsmayıl qızı** 27 avqust 1948-ci ildə Qasım İsmaylov (indiki Goranboy) rayonunun Faxralı kəndində, həkim ailəsində anadan olmuşdur. Ailədə ilk qız övladı olmaqla üç bacı və iki qardaş ilə birlikdə böyümüşdür. 1955-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə daxil olan Tofiqə müəllim 1966-cı ildə həmin məktəbi bitirmişdir. Elə həmin il

H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun tarix fakültəsinə qəbul olub və ali təhsilini bitirərək təyinatla 27 saylı orta məktəbdə, sonra isə 40 saylı orta məktəbdə, sevdiyi tarix dərsini tədris etmişdir. 1982-ci ildə isə 28 saylı orta məktəbdə təlim-tərbiyə işləri üzrə direktor müavini vəzifəsinə təyin olunmuşdur. Ömrünün sonuna kimi həmin vəzifədə çalışıb. 1997-ci il noyabırın 15-də əbədi olaraq həyata əlvida dedi. Üç övlad var.



**İsmayılov Yurik İsmayıl oğlu** 03 iyul 1950-ci ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olmuşdur. 1956-cı ildə Faxralı kənd orta məktəbinin I sinfinə gedib və 1966-cı ildə həmin məktəbin onuncu sinfini bitirib. 1967-ci ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun biologiya fakültəsinə qəbul olmuş və 1972-ci ildə həmin institutu bitirmişdir. Yurik müəllim 1972-ci ildən 1973-cü ilə kimi hərbi xidmətdə olub. Hərbi xidməti başa vurduqdan sonra Faxralı kənd orta məktəbində biologiya fənni üzrə müəllim kimi əmək fəaliyyətinə başlayıb. O, 1989-cu ildən 1998-ci ilə kimi həmin məktəbdə tədris işləri üzrə direktor müavini işləyib. 1998-ci ilin mart ayının 16-da vəfat edib. Dörd övladı var.



**Kərimova Roza Cəmil qızı** 15 may 1946-cı ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Yəhərçi Qazaxlar kəndində anadan olub. 5 yaşında yəni 1951-ci ildə Yəhərçi Qazaxlar kənd yeddiillik orta məktəbinin I sinfinə qəbul olunub və 1958-ci ildə həmin məktəbin 7-ci sinfini bitirərək təhsilini davam etdirmək üçün Faxralı kənd orta məktəbinə qəbul olunub. 1961-ci ildə Faxralı kənd orta məktəbinin onuncu sinfini bitirib. 1964-cü ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun dil-ədəbiyyat fakültəsinə qiyabi qəbul olunub. 1965-ci ildə Yəhərçi Qazaxlar kənd məktəbində müəllim kimi əmək fəaliyyətinə başlayıb. 1969-cu ildə institutu bitirib və həmin ildən Faxralı kənd orta məktəbində dil-ədəbiyyat müəllimi işləməyə başlayıb. İşlədiyi illərdə dərs dediyi bir çox şagirdləri müxtəlif ali

təhsil ocaqlarına qəbul olaraq tələbə adına layiq görülmüşlər. Hal-hazırda təqaüdçü müəllimdir. Dörd övladı var.



**Quluyeva Dilbər İsgəndər qızı** 23 fevral 1951-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1958-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1968-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. Orta məktəbi bitirdikdən sonra K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda işləyib. 1969-cu ildə H.Zərdabi adına Kirovabad şəhəri (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və 1973-cü ildə oranın tarix fakültəsini bitirib. 1973-cü ildə institutun təyinatına əsasən Faxralı kənd orta məktəbinə müəllim təyin edilib. Hal-hazırda Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbinin tarix fənni üzrə müəllimidir. Dörd övladı var.



**Qurbanova İlhamə Əli qızı** 01 may 1969-cu ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Dəliməmmədli qəsəbəsində anadan olub. Orada orta məktəbi qurtardıqdan (1976-1986) sonra Dəliməmmədli qəsəbə musiqi məktəbində kitabxanaçı kimi əmək fəaliyyətinə başlayıb (1987). Azərbaycan Pedaqoji Rus dili və Ədəbiyyatı İnstitutunu "Fərqlənmə" diplomu ilə bitirib (1987-1992). Dəliməmmədli qəsəbəsində müəllim (1992), Mingəçevir şəhərində 7 saylı məktəbdə rus dili müəllimi (1993-1997) işləyib. 1998-ci ildən hal-hazıra kimi Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində müəllim işləyir. İki övladı var.

**Qurbanov Sadəddin İbrahim oğlu** 1935-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi qurtardıqdan sonra H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və oranın Tarix müəllimi ixtisasını bitirib. Faxralı kənd orta məktəbində tarix müəllimi işləyib. 1988-ci ildə oğlunu hərbi xidmətə yola salanda Biləcəri qəsəbəsində

vəfat edib. Faxralı kənd qəbirstanlığında dəfn olunub. Dörd övladı var.



**Qurbanov Sahib İbrahim oğlu** 18 fevral 1941-ci ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi qurtarandan sonra Kirovabad (indiki Gəncə) Toxuculuq Texnikumunun “xammalın ilk emalının istehsal texnologiyası və avadanlığı” ixtisasını (1959-1962) və qiyabi olaraq Azərbaycan Pedaqoji İnstitutunun “Dil-ədəbiyyat” ixtisasını bitirib (1967-1972). İxtisas artırma kursu keçib “baş müəllim” dərəcəsi alıb (1975). Qasim İsmayılov (indiki Goranboy) rayonunun Dəliməmmədli qəsəbəsi Texniki Peşə məktəbində müəllim (1968-1985), Qurbanzadə kənd natamam orta məktəbində direktor vəzifəsində işləyib (1985-1993). Hal-hazırda təqaüdçüdür. Beş övladı var.



**Qurbanov Vaqif Məmməd oğlu** 30 avqust 1944-cü ildə Kirovabad (indiki Cəncə) şəhərində anadan olub 1949-cu ildən Qasım İsmayılov (indiki Goranboy) rayununun Faxralı kəndində yaşayır. 1951-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə qəbul olub və 1961-ci ildə həmin məktəbin 10-cu sinfini bitirib. 1961-ci ildə orta məktəbi bitirdik-dən sonra H.Zərdabi adına Kirovabad (indiki Gəncə) şəhər 15 saylı texniki peşə məktəbinə qəbul olub və 1963-cü ildə oranı qurtararaq Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun “ibtidai təhsilin pedaqoqikası və metodikası” ixtisasına əyani qəbul olub. 1963-cü ildə I kursdan hərbi xidmətə çağrılıb və 1966-cı ilə kimi Belarusiya respublikasında olan hərbi hissərin birində tank bölməsində xidmət edib. 1966-cı ildə ordu sıralarından tərxis olunduqdan sonra ali təhsilini davam etdirib. Vaqif müəllim 1969-cu ildə təhsilini bitirərək təyinatla Faxralı kənd orta məktəbinə müəllim göndərilib və ibtidai siniflərdə rus dilini tədris edib. İşlədiyi illər ərzində bir neçə dəfə ixtisasartırma kursları keçib. Hal-hazırda təqaüdçü müəllimdir. Dörd övladı var.



**Məmmədova Aləmzər Məzahim qızı** 04 oktyabr 1959-cu ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1967-1977-ci illərdə Faxralı kənd orta məktəbini bitirib. H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun riyaziyyat fakültəsini fərqlənmə diplomu ilə bitirib (1977-1981). Goranboy rayon Quşçular kənd orta məktəbində riyaziyyat müəllimi işləyib. Hal-hazırda Goranboy rayon T.Sadıqov adına Faxralı kənd orta məktəbində müəllim işləyir. Üç övladı var.



**Məmmədov Eşqin İqaf oğlu** 28 aprel 1971-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirib (1978-1988). SSRİ SQ-də hərbi xidmət keçib (1989-1991). 1992-ci ildə Gəncə Dövlət Pedaqoji İnstitutuna qəbul olub və 1997-ci ildə oranın ÜTF və informatika fakültəsini bitirib. 2000-ci ildən T.Sadıqov adına Faxralı kənd orta məktəbində direktor müavini və müəllim işləyir. İki övladı var.



**Məmmədov Hekəl İlyas oğlu** 04 dekabr 1939-cu ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirib H.Zərdabi adına Kirovabad Pedaqoji İnsitutunun fizika-riyaziyyat fakültəsinə qəbul olub və oranı fizika ixtisası üzrə qurtarıb (1959-1964). Müəllim fəaliyyətinə təyinatla Zərdab rayonunun Bıçaqçı kənd orta məktəbində başlayıb (1964). Zərdab və Uçar rayonlarında fizika fənnini tədris edib (1964-1973). Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kənd orta məktə-bində müəllim (1973-1982), direktorun tədris işləri üzrə müavini (1982-2001), Gəncə səhərindəki 27 saylı texniki peşə məktəbində müəllim işləmiş, Gil-torpaq kombinatı üçün kadrlar hazırlamışdır və

hal-hazıda Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində müəllim işləyir. Yeddi övladı var.



**Məmmədov Əflatun Şahin oğlu** 1975-ci il iyulun 31-də Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1982-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə daxil olub və 1992-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. Orta məktəbi bitirdikdən sonra Azərbaycan Kənd Təsərrüfatı Akademiyasına qəbul olub və 1997-ci ildə oranı müvəffəqiyyətlə başa vurub. 1997-ci ildən 2004-cü ilə kimi "Nəsifli" fermer təssərrüfatında çalışıb. 2004-cü ildə zabit kimi hərbi xidmətə çağrılıb və N saylı hərbi hissədə xidmətini şərəflə başa vurub. Hərbi xidməti dövrində baş leytenant rütbəsi alıb. Hal-hazırda Goranboy rayonunun H.Cəfərov adına Quşçular kənd orta məktəbində hərbi rəhbər vəzifəsində çalışır.

Goranboy rayonunun Faxralı kəndində "Gənclər Təşkilatı"-nın sədri və Goranboy rayonunun yığma voleybol komandasının məşqçisidir. Üç övladı var.



**Məmmədova Nəzakət Babakişi qızı** 1946-cı ildə Qazax rayonunda anadan olub. Əslən Faxralılıdır. 1951-1961-ci illərdə orta məktəbi bitirdikdən sonra 1962-ci ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və 1966-cı ildə həmin institutun "ibtidai təhsilin pedaqoqikası və metodikası" fakültəsini bitirib. 1966-cı ildə təyinatla Faxralı kənd orta məktəbinə müəllim təyin edilib və həmin vaxtdan ailə qurub Faxralıda yaşayır. 1966-cı ildən hal-hazıra kimi T.Sadıqov adına Faxralı kənd orta məktəbində ibtidai sinif müəllimi işləyir. İki övladı var.



**Məmmədova Məkufə İslam qızı** 01 iyun 1949-cu ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1956-cü ildə Faxralı kənd orta məktəbində 1-ci sinfə gedib və 1966-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1968-ci ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və 1973-cü ildə oranın "ibtidai təhsilin pedaqoqikası və metodikası" ixtisası üzrə tam kursunu bitirib. 1973-cü ildə institutun təyinatına əsasən Faxralı kənd orta məktəbinə müəllim təyin edilmişdir. Hal-hazırda Goranboy rayon T.Sadıqov adına Faxralı kənd orta məktəbində ibtidai sinif müəllimidir. Dörd övladı var.



**Məmmədova Solmaz Həsən qızı** 1946-cı ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1953-cü ildə Faxralı kənd otra məktəbinin 1-ci sinfinə gedib və 1964-cü ildə həmin məktəbin onuncu sinfini bitirib. Məktəbi bitirdikdən sonra H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun riyaziyyat fakültəsinə qəbul olub və 1969-cu ildə həmin institutun riyaziyyat ixtisasını bitirib. İnstitutdan təyinatla Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kənd orta məktəbinə riyaziyyat müəllimi işləmək üçün göndərilib. Hal-hazırda da həmin məktəbdə müəllim işləyir. Beş övladı var.



**Musayeva Alidə Həmdulla qızı** 01 sentyabr 1950-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1957-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1967-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1970-ci ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna qəbul olub və 1976-cı ildə qiyabi həmin institutun "dil-ədəbiyyat" ixtisası üzrə tam kursunu bitirib. 1973-cü ildən Faxralı kənd orta məktəbində müəllim kimi əmək fəaliyyətinə

başlayıb. İşlədiyi müddətdə heç bir töhmət almayıb. Hal-hazırda Goranboy rayon T.Sadıqov adına Faxralı kənd orta məktəbində dil-ədəbiyyat müəllimidir. İki övladı var.



**Musayeva Tamzarə Qara qızı** 27 iyul 1949-cu ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1966-cı ildə orta məktəbi bitirdikdən sonra K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda işləyib. Qiyabi təhsil alıb. Nəsrəddin Tusi adına Azərbaycan Pedaqoji İnstitutnun "İbtidai təhsilin pedaqoqikası və metodikası" ixtisasını bitirib (1968-1972). 1968-ci ildən pedaqoji fəaliyyətə başlayıb. Əməli ilə qəlbini, zəkasını fidan balalara qələm tutub Əlifbanı oxumağı-yazmağı öyrətməyə həsr etdiyini təsdiq etmiş və onların hərtərəfli inkişafında və tərəqqisində xüsusi fəallığı olduğundan 1985-ci ildə **"Metodist müəllim"** adına layiq görülmüşdür. 5 il Goranboy rayonunun T.Sadıqov adına Faxralı kənd orta məktəbində təşkilatçı müavin işlədikdən sonra, 1998-ci ildən bu günə kimi həmin məktəbin direktorunun təlim-tərbiyə işləri üzrə müavini və eyni zamanda sinif müəllimi işləyir. Üç övladı var.



**Mustafayeva Seva Turab qızı** 13 oktyabr 1954-cü ildə Qasım Ismayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1961-ci ildə Faxralı kənd orta məktəbinin I sinfinə gedib və 1971-ci ildə həmin məktəbin onuncu sinfini bitirdikdən sonra H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun dil-ədəbiyyat fakültəsinə qəbul olub. 1975-ci ildə institutu bitirdikdən sonra təyinatla Qasım İsmayılov (indiki Goranboy) rayonunun Qurbanzadə kəndinin səkkizillik məktəbinə müəllim təyin edilib. 1979-cu ildən hal-hazıra kimi Faxralı kənd orta məktəbində dil-ədəbiiyat müəllimi işləyir. Bir neçə dəfə ixtisasartırma kursları keçib. 2005-ci ildə Qırmızı Xaç Cəmiyyətinin keçirdiyi konfrasda dinləyici olub. Dörd övladı var.



**Nəbiyeva Fira İsrafil qızı** 18 mart 1950-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1957-ci ildə Faxralı kənd orta məktəbinin I sinfinə gedib və 1967-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1968-ci ildə qiyabi H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun riyaziyyat fakültəsinə qəbul olub. 1974-cü ildə həmin institutu bitirib. 1970-2003 illərdə Qasım İsmayılov (idiki Goranboy) rayonunun Faxralı kənd orta məktəbində lobarant və riyaziyyat müəllimi işləyib. 1978-ci ildə Azərbaycan SSR Müəllimlərinin IV qurultayının nümayəndəsi olub. Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kənd orta məktəbində ilk partiya təşkilatının katibi kimi fəaliyyət göstərib. Fira müəllimin K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda əmək fəaliyyəti yüksək olduğu üçün 1970-ci ildə "**Leninin 100 illiyi"** yubiley medalı ilə təltif olunub. İki övladı var.



**Sadıqov Fərman Əlövsət** oğlu 21 oktyabr 1974-cü ildə Qasım Ismayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində ziyalı ailəsində anadan olub. 1981-ci ildə Faxralı kənd orta məktəbinin birinci sinfinə gedib və 1991-ci ildə həmin məktəbin 11-ci sinfini bitirib. 1992-ci ildə test imtahanlarından uğurla keçib və N.Tusi adına Azərbaycan Dövlət Pedaqoji Universitetinin kimya-biologiya fakültəsinə qəbul olub. 1997-ci ildə universiteti fərqlənmə diplomu ilə bitirib və kimya biologiya müəllimi ixtisasına yiyələnib. 1997-ci ildə T.Sadıqov adına Faxralı kənd orta məktəbinə kimya-biologiya müəllimi göndərilib və 2002-ci ilə qədər həmin məktəbdə gənclərin təlim-tərbiyəsi ilə məşğul olub. Həmin illərdə Fərman müəllim eyni zamanda Gəncə şəhərində Türklərin təşkil etdiyi Araz hazırlıq kursunda kimya fənnindən dərs deyib və gənclərin ali məktəblərə qəbul olunmaları üçün onların hazırlanmasında fəal iştirak edib. O, 2002-ci ildən hal-hazıra kimi Gəncə şəhərinin 46 saylı orta məktəbində kimya-biologiya müəllimi işləyir. Fərman müəllim gənc oğlan və qızların ali məktəblərə qəbul olunmaları üçün test imtahanlarına hazırlaşmalarında əlindən gələn köməkliyi edir. Onun dərs dediyi şa-

girdlər Azərbaycan respublikasının müxtəlif universitetlərinə qəbul olunur və yetirmələri hal-hazırda həkim, müəllim, mühəndis və s. peşələrində xalqa ləyaqətli xidmət edirlər. İki övladı var.



**Sadıqova Naqilə Salman qızı** 27 sentyabr 1943-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1950-ci ildə Faxralı kənd orta məktəbinin birinci sinfinə gedib və 1961-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1963-ci ildə H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun qiyabi "İbtidai təhsilin pedaqoqikası və metodikası" fakültəsinə qəbul olub və 1968-ci ildə həmin institutu bitirib. Naqilə müəllim Faxralı kənd orta məktəbində sinif müəlliminə ehtiyac olduğundan 1963-cü ildən müəllim kimi əmək fəaliyyətinə başlayıb. Hal-hazırda da təqaüdçü müəllimdir. Onun yetirdikləri şagirdlər bir çox sahələr üzrə institutlara qəbul olaraq gözəl peşə sahibləri olublar. Dörd övladı var.

# SƏHİYYƏ İŞÇİLƏRİ

**Əfəndiyeva Kimya Yaqub** qızı 1940-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra (1950-1960) Kirovabad (indiki Gəncə) şəhər N.K. Krupskaya adına baza tibb məktəbinə daxil olub və oranı tam kurs üzrə bitirib (1961-1964). Goranboy rayonunun Faxralı kənd Tibb Məntəqəsində mamaça işləyib (1964-2000). 2000-ci ildən hal-hazıra kimi isə həmin Məntəqədə müdir vəzifəsində işləyir. QHT (Qeyri Hökümət Təşkilatı) tərəfindən təşkil edilmiş "İcmanın səfərbər olunması" mühazirəsinin dinləyicisi olub və şəhadətnamə alıb (2002). Hollandiyanın "Sərhədsiz Həkimlər" təşkilatı tərəfindən keçrilən mühazirələrin də dinləyicisi olub və şəhadətnamə alıb (1997-1998). Səhiyyə əlaçısıdır. Dörd övladı var.



**Əhmədov Müseyib Tapdıq oğlu** 10 aprel 1971-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1978-ci ildə Faxralı kənd orta məktəbinin I sinfinə gedib və 1988-ci ildə həmin məktəbin onuncu sinfini **"Gümüş Medal"**la qurtarıb. Məktəbi bitirdikdən sonra N.Nərimanov adına Azərbaycan Dövlət Tibb Universitetinə qəbul olub və oranı travmatologiya və ortopediya ixtisası üzrə fərqlənmə diplomu ilə bitirib (1988-1994). 1994-1995-ci illərdə 1 saylı hərbi hospitalda travmatologiya və ortopediya ixtisası üzrə internatura keçib. Müseyib həkim 1997-ci ildə Ukrayna respublikası Xarkov şəhəri Sitenko adına Travmatologiya və Ortopediya İnstitutunda və 2001-ci ildə Ə.Əliyev adına Azərbaycan Dövlət Həkimləri Təkmilləşdirmə İnistitutunda Travmatologiya və Ortopediya təhsili üzrə ixtisaslaşma kursları keçib.

Müseyib həkim 1992-ci ildə Qarabağ uğrunda gedən döyüşlər də Ağdam rayonunun Sarıcalı hospitalında bir çox ağır yaralıların həyata qaytarılmasında böyük şücaət göstərmiş və həmçinin Ağdam istiqamətində gedən döyüşlərdə iştirakçı olmuşdur. O, Qarabağ müharibəsi veteranıdır.

İnstitutu bitirdikdən sonra həkim kimi fəaliyyətə başlayıb. O, Ukrayna respublikası Mariupol şəhəri 2 saylı şəhər klinik xəstəxanasında həkim Travmatoloq-Ortoped (1995-1998), Azərbaycan respublikası Gəncə şəhəri Fiziki Bədən Tərbiyəsi kompleksində həkim Travmatoloq-Ortoped (1999), Bakı şəhəri Travmatologiya və Ortopediya Klinik xəstəxanasında həkim Travmatoloq-Ortoped (2000-2002) və Səudiyyə Ərəbistanı Krallığı Buraydah şəhəri Buraydah Mərkəzi Hospitalının Ortopediya şöbəsində Ortopedik cərrah (2002-2009) kimi işləyib. 2009-cu uldən hal-hazıra kimi Bakı şəhəri Mərkəzi Gömrük Hospitalında Travmatologiya və Ortopediya şöbəsində həkim ortoped-travmatoloq işləyir.

Müseyib həkim bir çox beynəlxalq konfrans, simpozium və kurslarda iştirakçı, dinləyici və məruzəçi olub. Saudi Council Həkimlər Cəmiyyətinin və AO spine dərnəyinin (İsveçrə) üzvüdür. O, daim yüksək savadı ilə seçilib və işlədiyi ölkələrdə Azərbaycan Respulikasını layiqincə təmsil edərək ölkəmizin adının yüksək

tutulmasında çox dəyərli xidmətləri olub. Həm də fəxrlə qeyd ediləsidir ki, Müseyib həkim nəinki Respublikamızda, həmçinin sərhədlərimizin hüdudlarından kənarda da bir çox dövlətlərin vətəndaşlarına şəfa verərək, onların həyatda yaşamalarına stimul verici bir həkim olub. Üç övladı var.



**Həmidov Müsahib Qəşəm oğlu** 03 fevral 1954-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1962-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1972-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1973-cü ildə N.Nərimanov adına Azərbaycan tibb İnstitutunun pediatriya fakültəsinə qəbul olunub və 1979-cu ildə həmin institutu bitirib. 1979-1980-ci illərdə Kirovabad (indiki Gəncə) şəhərində 1 saylı uşaq xəstəxanasında internatura keçib. Müsahib həkim institututda oxuduğu 1977-1979-cu illərdə Bakı şəhəri Onkologiya Elmi-Tədqiqat İnstitunda gecə növbəsində tibb qardaşı işləyib və buna görə də internatura müddətində növbətciliyə sərbəst təyin edilib. O, institutda tələbə qrup komsomol komutəsinin katibi və qrup həmkarlar təşkilatının sədri olub. Dəfələrlə ixtisas artırma kursları keçib və səhiyyə sahəsində müxtəlif seminarların dinləyicisi olub. 1980-ci ildən hal-hazıra kimi Qasım İsmayılov (indiki Goranboy) rayonunun Mərkəzi Xəstəxanasının Dəliməmmədli qəsəbəsindəki xəstəxanasında sahə pediatrı işləyir. İşlədiyi müddətdən həmin xəstəxananın həmkarlar təşkilatının katibidir. 1984-1985-ci illərdə Müsahib həkimin yazdığı elmi-praktiki hesabat işi səhiyyə sahəsində bəyənilib və ona görə baş idarə tərəfindən "Təşəkkür" alıb. Üç övladı var.



**Hüseynov Abdulla Nürəddin oğlu** 19 avqust 1979-cu ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1985-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1996-cı ildə həmin məktəbin on birinci sinfini bitirib. 1997-1999-cu illərdə hərbi xidmət keçib. Hərbi xidmət keçdikdən sonra həkim olmaq arzusu ilə öz üzərində çalışan Abdulla həkim nəhayət 2001-ci ildə Azərbaycan Tibb Universitetinə qəbul olub və 2007-ci ildə oranın pediatriya fakültəsini bitirib. 2007-2008-ci illərdə otolorinqologiya üzrə internaturanı bitirib. Hal-hazırda Bakı şəhəri Nərimanov rayonunun 14 saylı poliklinikasında həkim otolorinqoloq işləyir. O, yüksək əxlaqı keyfiyyətlərinə və bacarığına görə az bir müddət ərzində işlədiyi kollektivdə böyük hörmət sahibi olub.



**Hüseynov Mehman Mülazim** oğlu 22 noyabr 1970-ci ildə Kirovabad (indiki Gəncə) şəhərində, qulluqçu ailəsində anadan olub. 1978-ci ildə Kirovabad (indiki Gəncə) şəhər 18 saylı orta məktəbin birinci sinfinə qəbul olub və 1988-ci ildə onillik orta təhsillə həmin məktəbi bitirib. Həmin ildə H.Qurbanov adına Gəncə Tibb məktəbinin "Müalicə işi "bölməsinə qəbul olub. 1989-cu ildən 1991-ci ilə qədər SSRİ silahlı qüvvələri sıralarında qulluq etib. Ordu sıralarından tərxis olunandan sonra tibb məktəbində təhsilini davam etdirmişdir. 1992-ci ildə tibb məktəbini bitirdikdən sonra Azərbaycan Respublikası silahlı qüvvələri sıralarında Ağdam cəbhə bölgəsində erməni təcavüzkarlarına qarşı döyüşlərdə iştirak edib. Həmin ilin oktyabr ayında ordu sıralarından tərxis olub və Gəncə Qarnizonu N saylı hərbi hospitalın travmatologiya şöbəsində feldşer vəzifəsinə qəbul edilib. 1996-cı ildə Azərbaycan Tibb Universitetinin müalicə-profilaktika fakültəsinə qəbul olub və 2002-ci ildə həmin fakultəni fərqlənmə diplomu ilə bitirib. 2002-ci il avqust ayının birindən 2003-cü il iyunun 31-nə qədər Z.Məmmədov adına Gəncə TTYX-nin travmotologiya şöbəsində həkim travmotoloq ixtisası

üzrə birillik internatura kursu keçib. 2003-cü ildən Gəncə şəhər 1 saylı Uşaq Poliklinikasında travmotoloq və 2005-ci ildən hal-hazıra kimi Gəncə şəhər Təcili Tibbi Yardım Xəstəxanasında travmotoloq həkim işləyir. İki övladı var.



**İsmayılov Hilal Hüseyn oğlu** 27 aprel 1954-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1961-ci ildə Faxralı kənd orta məktəbinin birinci sinfinə gedib və 1971-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1971-ci ildə Azərbaycan Tibb İnstitutunun "Müalicə-profilaktika" fakultəsinə daxil olub və 1977–ci ildə həmin fakültəni bitirib. İnternaturanı Kirovabad (indiki Gəncə) şəhəri Təcili Tibbi Yardım Xəstəxanasında keçib (1977-1978). Kirovabad (indiki Gəncə) şəhəri TTY xəstəxanasında (1978-1981), Kirovabad (indiki Gəncə) şəhər Dəmiryol xəstəxanasında (1981-1982), Kirovabad (indiki Gəncə) şəhər Onkoloji dispanserdə (1982-1986) və Kirovabad (indiki Gəncə) şəhər A.Səhhət adına xəstəxanada həkim işləyib (1986-1990). 1990-cı ildən hal-hazıra kimi Gəncə şəhər Diaqnostika Mərkəzində həkim endoskopist işləyir. Hilal həkim Azərbaycanın qərb bölgəsində ilk endoskopist həkimdir. Hilal həkim Moskvada ixtisaslaşma kursu və Bakı şəhərində dəfələrlə ixtisas artırma kursları keçib. O, səhiyyə sahəsində keçmiş Ümumittifaq seminarlarında bir neçə dəfə iştirak edib. Azərbaycan Onkoloqlar cəmiyyətinin üzvü seçilib. İstefada olan baş leytenantdır. Hilal həkim bir neçə ictimai işlərlə də məşğul olub, o cümlədən Gəncə şəhəri Nizami rayonu üzrə seçki komissiyasının sədri olub. O, həkimlik peşəsində olan ən dəyərli əxlaqi keyfiyyətləri ilə həmişə qabaqcıl olub. Onun qəbulunda olan anda, bütün xəstələr əzyət çəkdikləri xəstəlikdən elə Hilal həkimin xoş üzlülüyü və gözəl tövsüyələri sahəsində qisməndə olsa sağalırlar. Çünki xəstəyə lazım olan mənəvi dəstək ilk baxışdan Hilal həkimin simasında vardır. Üç övladı var.



**İsmayılov İsmayıl Yusif oğlu** 1921-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olmuşdur. 1940-cı ildə Kirovabad (indiki Gəncə) şəhər Tibb Texnikumunu bitirmiş və 1941-ci ildən 1946-cı ilə qədər Böyük Vətən müharibəsinin iştirakçısı olmuşdur. 1947-ci ildən 1992-ci ilə qədər Faxralı kəndində feldşer işləmişdir. İsmayıl həkimin sayəsində bir çox Faxralı sakinləri müxtəlif növ xəstəliklərdən şəfa taparaq ağır xəstəliklərə düçar olmaqdan qurtulmuşlar.

**"Böyük Vətən Müharibəsinin Qələbəsinin 20 illiyi"** (1965), **"Böyük Vətən Müharibəsinin 30 illiyi"** (1975), **"Əmək Veteranı"** (1977), **"Böyük Vətən Müharibəsində Qələbənin 40 illiyi"** (1981) medalları və digər orden, medallarla təltif olunmuşdur.

Altı övlad atası olmuş və 1992-ci il yanvar ayında vəfat etmişdir.



**Qurbanov Ziya Mahir oğlu** 29 oktyabr 1985-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1992-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 2003-cü ildə həmin məktəbin 10-cu sinfini bitirərək Azərbaycan Tibb Universitetinin Pediatriya fakültəsinə qəbul olub. 2009-cu ilin iyul ayında bir aylıq Türkiyə Cumhuriyyətində Pediatriya ixtisası üzrə təcrübbə keçib. 2009-cu ildə həmin universitetin "endokrinologiya" ixtisasını, 2010-cu il 29 iyunda isə İnternaturanı bitirərək həkim adını alıb.

**İsmayılova Lətifə Möhtəşəm qızı** 9 yanvar 1971-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1977-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə daxil olub və 1987-ci həmin məktəbin onuncu sinfini bitirib. 1989-cu ildə Azərbaycan Tibb İnstitutunun pedriatriya fakültəsinə qəbul və 1996-cı ildə institutu bitirib, həkim pediatr ixtisasına yiyələnib. Lətifə həkim Faxralı kəndində ilk ali təhsil alan həkim qadındır. O, 1999-cu ildə Bakı şəhəri Sabunçu rayonunda 2 saylı poliklinkada işə qəbul olunub. 2006-cı ildən hal-hazıra kimi Azərbaycan Respublikası

Daxili İşlər Nazirliyinin Daxili qoşunlarının Hospitalında həkim pediatr işləyir. Tibb xidməti kapitanıdır. İki övladı var.



**Məmmədov Firdovsi Alı oğlu** 30 oktyabr 1954-cü ildə Kirovabad (indiki Gəncə) şəhərində anadan olub. 1961-ci ildə Kirovabad (indiki Gəncə) şəhər 15 saylı orta məktəbin birinci sinfinə daxil olub, 1966-cı ildə isə 41 saylı orta məktəb tikilib və ərazi bölgüsü üzrə o, təhsilini orada davam etdirib. AKTİ-yə daxil olmaq məqsədi ilə 1970-ci ildə ata yurdu Faxralıya gələrək orta məktəb təhsilini 1971-ci ildə burada başa vurub. 1971-ci ildə Azərbaycan Tibb İnstitutunun müalicə-profilaktika fakültəsinə daxil olub və 1977-ci ildə həmin institutu bitirib. 1975-ci ildə 1 saylı dəmir yolu xəstəxanasında feldşer işləyib. 1977-1978–ci illərdə 3 saylı xəstəxanada internatura keçib. İnstitutu bitirdikdən sonra təcili yardımda (1978-1984), 2 saylı Tibbi Sanitar Hissədə həkim (1984), 1 saylı poliklinikada həkim (1985-1990) işləyib. 1990-cı ildən bu günə kimi Gəncə şəhər Diaqnostika Mərkəzində işləyir. Bakıda və Moskvada təkmilləşmə kursları keçib. İxtisasını dəyişib. Hal-hazırda nevropatoloq həkim işləyir. Beyin aparatları elektroen-sefaloqrafiya və exoensefaloqrafiya aparatları işlədir.

Firdovsi həkim həkimlik sənəti ilə yanaşı, həm də qəlbləri oxşayan gözəl şeirləri ilə də insanların ürəklərini oxşaya bilir. Bu da ona öz peşəsində xəstələrin ələ alınması və həkimə tabeçiliyində özlərini ram etdirilmələri üçün çox gözəl köməklik edir. O, həmçinin xəstələrin normal həyata baxışlarını təmin etmək üçün düzgün diaqnozları və müalicələri ilə daim diqqət mərkəzində olur. 2009-cu ildə işıq üzü görmüş “İnnən sonra nolasıyam, nolası?” və 2010-cu ildə işıq üzü görmüş “Qəlbimin pıçıltıları” kitablarının məllifidir. İki övladı var.



**Musayev Əli Həmdulla oğlu** 1952-ci il 11 fevralda Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1958-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1968-ci ildə həmin məktəbin onuncu

sinfini bitirib. 1968-ci ildə Azərbaycan Politexnik Institutunun Kimya texnologiyası  fakültəsinə qəbul olub. Həmin institutun 3-cü kursunda olarkən 1972-ci ildə sənədlərini N.Nərimanov adına Azərbaycan Tibb İnistitutunun Sanitariya-Gigiyena fakültəsinə verir və qəbul olur. 1978-ci ildə Azərbaycan Tibb İnstitutunu Sanitar həkim ixtisası üzrə bitirib. 1978-ci ildən 1997-ci ilə kimi Goranboy rayonunda Sanitar Epidemioloq həkim və şöbə müdiri işləyib. 1997-ci ildən hal-hazıra kimi Bakı şəhəri 2 sayılı Baza Tibb məktəbində müəllim işləyir. İki övladı var.

**Musayev Orxan Əli oğlu** 23 noyabr 1984-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Qasım İsmayılov (indiki Goranboy) rayonunun 3 sayılı məktəbində 1-ci sinfə gedib və Bakı şəhərində 9 saylı məktəin on birinci sinfini bitirib. O, 9-cu və 10-cu siniflərdə oxuyarkən Azərbaycan Respublikası Kimya olimpiadasının qalibi olub. Orxan 10-cu sinifdə oxuyan zaman Hollandiyada kimya fənni üzrə keçrilən Beynəlxalq Olimpiadanın iştirakçısı olub. 2003-cü ildə Azərbaycan Tibb Universitetinin Stomotologiya fakültəsinə qəbul olub və 2008-ci ildə həmin universiteti bitirib. 2008-2009-cu illərdə internaturanı Bakı şəhəri Stomotoloji Poliklinikada keçib. 2009-cu ildən hal-hazıra kimi N saylı hərbi hissədə həkim işləyir.



**Sadıqov Arif Həsən oğlu** 1952-ci il 25 noyabr tarixdə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1959-cu ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1970-ci ildə Faxralı kənd orta məktəbini bitirib və həmin il N.Nərimanov adına Azərbaycan Dövlət Tibb Institutunun “müalicə-profilaktika” fakültəsinə qəbul olub. 1977-ci ildə institutu bitirib və təyinatla Qasım İsmayılov (indiki Goranboy) Rayon Mərkəzi Xəstəxanasına həkim terapevt göndərilib. 1990-cı ilə kimi Rayon Mərkəzi Xəstəxanasında həkim kordioloq vəzifəsində işləyib. Rayon hərbi Komisarlığının baş həkimi, Rayon Mərkəzi Xəstəxanasının baş həkiminin müavini işləyib.

Arif həkim Faxralı kəndində ilk ali təhsil almış həkimdir. 1990-cı ildən Gəncə Diaqnostika mərkəzinə kordioloq həkim təyin olunub və hal-hazıra kimi orada işləyir. O, daim yüksək bacarığı ilə kordioloji sahədə müvəffəqiyətlər əldə etmişdir. Belə ki, Arif həkim qəbulunda olan xəstələrə ümüd verici boş sözlər verməyib, o, xəstələri müayinə edərək dəqiq diaqnoz qoyub, düzgün müalicə metodundan istifadə yolu ilə xəstələri dücar olduğu xəstəlikdən xilas edib. Üç övladı var.



**Sadıqov Elxan Əlövsət oğlu** 30 yanvar 1978-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1984-cü ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1995-ci ildə həmin məktəbin onuncu sinfini bitirərək həmin ildə Azərbaycan Dövlət Tibb Universitetinə qəbul olub və oranı 2001-ci ildə fərqlənmə diplomu ilə bitirərək, uroloq cərrah ixtisasına yiyələnib. 2001-2002-ci ildə professor Kamal Abdullayevin rəhbərliyi altında internaturanı bitirib. 2002-2004-cü illərdə taborun tibb xidməti rəisi vəzifəsində hərbi xidmət keçib. Ehtiyyatda olan baş leytenatdır. O, 2006-cı ildə Akademik Cavadzadənin rəhbərliyi altında ixtisasartırma kursu keçib. Elxan həkim Tibb Universitetində oxuduğu illərdə universitetin tələbə gənclər təşkilatının sədri olub. Hal hazırda Gəncə şəhər Təcili Tibbi Yardım xəstəxanasında uroloq cərrahdır. O, dəfələrlə Kəpəz televiziyasında səhiyyə sahəsi üzrə gedən verlişlərdə öz ixtisası üzrə maarifləndirici çıxışlar edib və vətəndaşların sağlamlıqlarının qayğısına qalmaları üçün öz tövsiyələrini verib. Elxan həkim iti zəkası və tez qərar qəbul etmə bacarıqları ilə işlədiyi illər ərzində kolektivdə yüksək hörmət və nüfuz əldə edib bilib. O, eyni zamanda əməliyyat etdiyi xəstələrə mənəvi-pisxoloji təsir edərək onların tez bir zaman ərzində sağalmasına da nail ola bilr. Onun sahəsində bir çox xəstələr, düçar olduqları xəsrəliklərdən şəfa taparaq həyatda normal insanlar kimi davranmağa qadir olublar. İki övladı var.



**Sadıqov Samir Arif oğlu** 1983-cü il 5 dekabrda Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1990-cı ildə Gəncə şəhərinin 2 saylı orta məktəbinin 1-ci sinfinə gedib və 2000-ci ildə Gəncə şəhərinin 10 saylı orta məktəbinin onuncu sinfini bitirib. 2001-ci ildə Azərbaycan Tibb Universitetinə daxil olub. 2006-cı ildə Tibb Universitetinin müalicə-proflaktika fakültəsini bitirib. 2007-ci ildə İnternatura keçdikdən sonra həkim adına layiq görülüb. 2007-2008-ci illərdə hərbi xidmətdə olub. 2008-ci ildə Əziz Əliyev adına Həkimləri Təkmilləşdirmə İnistitutunun 6-aylıq ixtisas dəyişmə kursunu bitirib. 2009-cu ildə Moskvada Akademik Kulakov adına Elmi-tədqiqat akuşer-ginekologiya və perinatol mərkəzində perinatologiya üzrə kurs keçib və sertifikatla təmin olunub. 2010-cu il 02 yanvardan “Şans” tibb mərkəzində həkim Ulturasonoloq ixtisası üzrə çalışır.

**Sadıqova Laləzər Hüseynalı qızı** 1954-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra (1961-1971) Kirovabad (indiki Gəncə) şəhər N.K.Krupskaya adına baza tibb məktəbinə daxil olub və oranı tam kurs üzrə bitirib (1971-1973). Goranboy rayonunun Mərkəzi xəstəxanasında növbətçi tibb bacısı (1974) işləyib. 1989-cu ildən hal-hazıra kimi Goranboy rayonunun Faxralı kənd Tibb Məntəqəsində Tibb bacısı vəzifəsində işləyir. Beş övladı var.



**Süleymanova Səfurə İsfəndiyar qızı** 1954-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra (1961-1971) Kirovabad (indiki Gəncə) şəhər N.K.Krupskaya adına baza tibb məktəbinə daxil olub və oranı tam kurs üzrə bitirib (1972-1975). Qasım İsmayılov (indiki Goranboy) rayon Mərkəzi xəstəxanasında növbətçi tibb bacısı (1975) işləyib. 1985-ci ildən hal-hazıra kimi Goranboy rayonunun Faxralı kənd Tibb Məntəqsində feldşer vəzifəsində işləyir. Dörd övladı var.

# MÜDAFİƏ VƏ HÜQUQ MÜHAFİZƏ İŞÇİLƏRİ



**Bayramov Əbülfət Tofiq oğlu** 10 iyul 1958-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1965-ci ildə Faxralı kənd orta məktəbinin birinci sinfinə daxil olub və 1975-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1976-cı ildə SSRİ SQ hərbi xidmətə çağrılmış, hərbi xidməti Ukrayna Respublikasının Donetsk şəhərində keçib və 1978-ci ildə hərbi xidmətdən tərxis olunmuşdur. 1979-cu ildə Kirovabad (indiki Gəncə) şəhərində Daxili İşlər Orqanlarında işə başlayıb. 1985-ci ildə Bakı şəhər Xüsusi Orta Milis məktəbinə qəbul olub və 1987-ci ildə həmin məktəbi bitirib. Elə həmin il, yəni 1987-ci ildən Naftalan şəhərinin Polis şöbəsində sahə müvəkkili, 1992-ci ildən həmin şöbədə Pasport xidmət rəisi təyin olunub. 1998-ci ildə Goranboy rayonunun Polis bölməsində Pasport Xidməti Rəisi vəzifəsində işləyib. 2000-ci ildən indiyədək Goranboy rayonunun Polis bölməsində sahə rəisi vəzifəsində çalışır.

Əbülfət müəllim Qarabağ uğrunda gedən döyüşlərdə Murovdağ, Gülüstan və Tapqaraqoyunlu istiqamətlərində döyüşüb. Qarabağ müharibəsi veteranıdır.

Qüsursuz xidmətlərə görə Azərbaycan SRİ Daxili İşlər nazirliyinin **“Qüsürsuz Xidmətlərə Görə”** I, II, III dərəcəli medalları və I dərəcəli məharət döş nişanı ilə təltif olunub.

Aldığı rütbələr leytenant (1987-1990), baş leytenant (1990-1994), kapitan (1994). Iki övladı var.



**Əhmədov İspəndiyar Şamil oğlu** 6 noyabr 1966-cı il Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1974-cü ildə Goranboy rayonunun Faxralı kənd orta məktəbinin 1-ci sinfinə daxil olub və 1984-cü ildə həmin məktəbin 10-cu sinfini bitirib. 1984-cü ildə Moskva Ali Yol, Mühəndis Komandanlığı məktəbinə daxil olub

və 1988-ci ildə həmin məktə-bi mülki müdafiə ixtisası üzrə bitirib. Hərbi məktəbi bitirdikdən sonra Müdafiə Nazirinin əmrinə əsasən xidmətini davam etdirmək üçün “N” saylı hərbi hissəyə göndərilib. 1988-ci il sentyabr ayından 1991-ci il may ayınadək “N” saylı hərbi hissədə mühəndis texniki taqımının komandiri, 1991-ci il may ayından 1992-ci il may ayınadək “N” saylı hərbi hissədə mexanikləşdirilmiş bölüyün komandiri, 1992-ci il may ayından 1994-cü il fevral ayınadək Zaqafqaziya Hərbi Dairəsi komandanının sərəncamında, 1994-cü il fevral ayından 1995-ci il yanvar ayınadək Azərbaycan Respublikası Mülki Müdafiə Qərargahında alayın mexanikləşdirilmiş bölüyünün komandiri, 1995-ci il yanvar ayından 1997-ci il noyabr ayınadək Azərbaycan Respublikası Mülki Müdafiə Qərargahında alayın mexanikləşdirilmiş taborunun qərargah rəisi, 1997-ci il noyabr ayından 2001-ci il sentyabr ayınadək “N” saylı hərbi hissənin qəza bərpa taborunun komandiri vəzifələrində xidmət edib. 2001-ci ildə Rusiya Federasiyası Fövqəladə Hallar Nazirliyinin Mülki Müdafiə Akademiyasına daxil olub və 2003-cü ildə həmin akademiyanı bitirib. Akademiyanı bitirdikdən sonra 2003-cü il iyul ayından 2004-cü il dekabr ayınadək Mingəçevir Mülki Müdafiə Regional şöbəsinin rəisi, 2004-cü il dekabr ayından 2006-cı il oktyabr ayınadək “N” saylı hərbi hissənin komandiri, 2006-cı il oktyabr ayından 2006-cı il dekabr ayınadək Naxçıvan Muxtar Respublikası Fövqəladə Hallar Nazirinin sərəncamında, 2006-cı il dekabr ayından 2007-ci il dekabr ayınadək “N” saylı hərbi hissənin qərargah rəisi, alay komandirinin müavini, 2007-ci il dekabr ayından “N” saylı hərbi hissənin komandiri vəzifəsinə təyin olunub və hal-hazırda həmin vəzifədə xidmət edir.

1989-cu ildə **“Hərbi xidmətdə fərqlənməyə görə”** I dərəcəli, 2003-cü ildə **“Qüsursuz xidmətə görə”** III dərəcəli, 2003-cü ildə **“Azərbaycan Respublikası Silahlı Qüvvələrinin 10 illiyi”** yubiley, 2009-cu ildə **“Hərbi xidmətlərə görə”** medalları ilə təltif olunub.

16.07.1988-ci il tarixdə «leytenant», 07.08.1990-cı il tarixdə «baş leytenant», 28.08.1993-cü il tarixdə «kapitan», 17.10. 1996-cı il tarixdə «mayor», 27.12.2000-ci il tarixdə «polkovnik leytenant», 24.06.2009-cu il tarixdə «polkovnik» hərbi rütbələri verilib. Dörd övladı var.



**Əhmədov Nəsrulla Şəmil oğlu** 1961-ci il 28 avqustda Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1968-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1978-ci ildə həmin məktəbin 10-cu sinfini bitirib. 1979-cu ildə Azərbaycan Kənd Təsərrüfatı Akademiyasının Mexanikləşdirmə fakultəsinə qəbul olub və 1984-cü ildə oranı "mühəndis-mexanik" ixtisası üzrə bitirib. 1984-1986-cı illərdə təyinatla İsmayıllı rayonunun 138 №li məktəbində müəllim işləyib. 1986-cı ilin oktyabr ayında Qasım İsmayılov (indiki Goranboy) rayonunun K. Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozunda mexanik, 1988-ci ildən 1992-ci ilə qədər briqadir işləyib. 1988-ci ildə kənd sovetinə deputat seçilib. 1992-1993-cü ilin sentyabr ayına kimi sahə mühəndisi işləyib. 1993-cü ilin sentyabrından könüllü olaraq milli orduda "N" sayılı hərbi hissədə batareya komandirinin təlim tərbiyə işləri üzrə müavini vəzifəsində xidmətə başlayıb. 1993-cü ilin dekabr ayında briqadalarda artilleriya divizionları ixtisara düşdükdən sonra xidmətini Mülkü Müdafiə Qoşunlarında davam etdirib. Əvvəl taqım komandiri, 1995-ci ildə bölük komandirinin texniki işlək üzrə müavini, 1997-ci ildə "N" sayılı hərbi hissənin Avtomobil xidməti rəisi vəzifəsinə təyin olunub. 2006-cı ildən EHN Mülkü Müdafiə Qoşunları "N" saylı hərbi hissənin avtomobil xidməti rəisi vəzifəsində xidmət edir.

1995-ci ildə kapitan, 1998-ci ildə mayor rütbəsi alıb.

**"Azərbaycan Respublikası Silahlı Qüvvələrinin 10 illiyi"** yubiley, **"Qüsursuz xidmətə görə"** 3-cü və 2-ci dərəcəli**, "Azərbaycan Respublikası Silahlı Qüvvələrinin 90 illiyi"** yubiley medalları ilə təltif olunub. Üç övladı var.



**Əhmədov Ülfət Tapdıq oğlu** 15 iyul 1965-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində ziyalı ailəsində anadan olub. 1972-ci ildə Faxralı kənd orta məktəbinin birinci sinfinə daxil olub və 1982-ci ildə həmin məktəbin onuncu sinfini əla qiymətlərlə bitirərək elə həmin ildə, yəni 1982-ci ildə mərhum ulu Öndərimiz Heydər

Əliyevin Siyasəti və köməyi sayəsində Ukrayna Respublikasının Mariupol Metallurgiya İnstitutunun texnologiya fakültəsinə daxil olub. 1989-cu ildə həmin institutu bitirib. 1984-1986-cı illərdə Sovet Ordu sıralarında həqiqi hərbi xidmət keçib. 1989-cu ildə gənc mütəxəs-sis kimi Gəncə Maşınqayırma Zavoduna mühəndis-texnoloq vəzifəsinə göndərilib və 1992-ci ilədək adı çəkilən zavodda müxtəlif vəzifələrdə çalışıb. 1992-1995-ci illərdə Gəncə Alüminium zavodunda, 1995-1998-cı illərdə Rusiya Federasiyasının Nijni Novqorod şəhərində AOZP "Firma Rassvet" firmasında işləyib. Ülfət müəllim 1999-2002-ci illər ikinci ali təhsil alaraq V.İ.Lobaçevski adına Nijni Novqorod Dövlət Universitetinin hüquq fakültəsini bitirib. 1999-2004-cü illərdə Nijni-Novqorod şəhəri Kanain rayon Hərbi komisarlığında hüquq sahəsi üzrə Komisar köməkçisi, 2008-2009-cu illərdə Azərbaycan Respublikası İqtisadi İnkişaf Nazirliyi yanında İstehlak Bazarına Nəzarət üzrə Dövlət Xidmətinin Gəncə-Qazax Regional Sektorunun Ekspertiza Bürosunda məsləhətçi vəzifələrində işləyib. O, 2009-cu ildən Azərbaycan Dövlət Aqrar Universiteti Distant və Əla Təhsil Mərkəzinin "İqtisadiyyatın tənzimlənməsi" ixtisasına qəbul olub və hal-hazırda həmin universitetin tələbəsidir. 22 aprel 2010-cu ildən Azərbaycan Respublikası Sosial Müdafiə Fondu Gəncə şəhər Kəpəz ra-yon şöbəsində məsləhətçihüquqşünas vəzifəsində çalışır. İki övladı var.



**Həmidov Eyvaz Çabir oğlu** 18 dekabr 1973-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirib (1980-1990). Məktəbdə oxuduğu 1988-1990-cı illərdə məktəbin Komsomol Təşkilatının Katibi ictimai vəzifəsini icra edib. Məktəbi bitirdikdən sonra K.Marks adına kolxozda kolxozçu işləyib (1990-1991). 1991-ci ildə S.Ağamalıoğlu adına Azərbaycan Kənd Təsərrüfatı Akademiyasının zoomühəndis fakültəsinə daxil olub və 1996-cı ildə institutu həmin ixtisas üzrə müvəffəqiyətlə bitirib, sonra isə fərdi təsərrüfatla məşğul olub (1996-1997). 1997-ci ildən 1999-cu ilədək Faxralı kənd Mədəniyyət Evinin müdiri vəzifəsində çalışıb. 1999-cu ilin avqust ayında Azərbaycan

Respublikası Silahlı Qüvvələrinə zabit kimi həqiqi hərbi xidmətə çağırılıb. Hərbi xidmətə "N" saylı hərbi hissədə gənc zabitlərin toplanışı ilə başlayıb, sonra "N" saylı hərbi hissədə MAT minaatan batareyasında atəş taqım komandiri (1999-2000), "N" saylı hərbi hissənin artilleriya divizionunun batareyasının atəş taqımının komandiri batareyanın baş zabiti (2000-2001), "N" saylı hərbi hissənin Mexaniki Taborunun minaatan batareyasının komandiri (2001-2002), "N" saylı hərbi hissənin artillerya divizionunda batareyanın komandiri (2002-2007), N" saylı hərbi hissənin artilleriya komandirinin MTT üzrə köməkçisi (2007-2009) vəzifələrində uğurla xidmət edib. 2009-cu ildən hal hazıra kimi "N" saylı hərbi hissənin artilleriya divizionunun komandir müavini vəzifəsində xidmət edir.

Aldığı rütbələr leytenent (1999-2000), baş leytenant (2000-2004), kapitan (2004-2009), mayor (2009).

2006-cı ildə SQ üzrə **"Ən Yaxşı Batareya Komandiri"** adı uğrunda yarışda 2-ci yerə layiq görülüb. Dəfələrlə yuxarı komandanlıq tərəfindən **"Təşəkkür"** və **"Fəxri Fərman"**larla təltif olunub. Üç övladı var.



**Həmidov Babək Ziyafəddin oğlu** 19 yanvar 1986-cı ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1992-ci ildə Gəncə şəhər 39 saylı orta məktəbin 1-ci sinfinə gedib və 2000-ci ildə 44 saylı orta məktəbdə təhsilini davam etdirib, 2003-cü ildə elə həmin məktəbi "əla" qiymətlərlə bitirib. 2003-cü ildə ali məktəblərə qəbul imtahanını uğurla keçdikdən sonra, "Azərbaycan" Universitetinin "hüquqşunaslıq" fakültəsinə qəbul olub. Təhsil aldığı müddətdə "Amerika Hüquqşunaslar Assosasiyası"nın,"Hüquq Maarifçilik Cəmiyyəti"nin və "Azərbaycan Hüquqçular Assossasiyası"nın üzvü olub və bu təşkilatların təşkil etdiyi tədbirlərdə fəal iştirak edib. "Məhkəmədə Vəkillik Bacarıqları", "Avropa İnsan Hüquqları Məhkəməsində İnsan Hüquqlarının müdafiəsi mexanizmi", "Məhkəmələrdə Çəkişmə Prinsipi" və ATƏT-in Bakı ofisinin təşkil etdiyi "Mülkiyyət

hüququnun Avropa İnsan Hüquqları Konvensiyası ilə müdafiəsi” adlı təlim kurslarınının iştarakçısı olub və kursları uğurla başa vurduğu üçün aidiyyatı üzrə “sertifikat”larla təltif olunub. 2007-ci ildə universiteti bitirdikdən sonra hərbi xidmətə çağırılmışdır. Hərbi xidmətini Azərbaycan Respublikası Dövlət Sərhəd Xidmətinin Sərhəd Qoşunlarında tam başa vurduqdan sonra, 2008-ci ilin İyul ayında ehtiyata buraxılmışdır. 2009-cu ilin mart ayında ATƏT və “Transparency İnternational”ın Gəncə şəhərində “İşci Seçim” müsabiqəsində iştirak edərək, 1 aprel 2009-cu il tarixdən ATƏT-in “Qanunun Aliliyi və Hüquq Resurs Mərkəzi”nin Gəncə ofisində Hüquqşunas vəzifəsində işə başlayıb. Hal-hazırda orada əmək fəaliyyətini davam etdirir.



**Xoyluyev Vüsal Sərraf oğlu** 28 sentyabr 1978-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1984-cü ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1995-ci ildə həmin məktəbin on birinci sinfini bitirib. 1995-ci ildə Bakı Ali Hərbi Dənizçilik Məktəbinə ilk dəfə test imtahanları ilə qəbul olunub və 1999-cu ildə oranın Arxa Cəbhənin Iqtisdiyyatı fakültəsinin “Qoşunların yanacaq-sürtgü materialları ilə təminatı” və “Mühəndis-İqtisadiyyatçı” ixtisası üzrə bitirib. 1996-cı ildə Bakı Ali Hərbi Dənizçilik Məktəbinin nəzdində fəaliyyət göstərən İctimai Peşə Fakültəsinin Jurnalistika bölməsinə daxil olub və 1998-ci ildə həmin bölmə üzrə tam kursu bitirərək “İctimai Müxbir” ixtisasına yiyələnib. Ali Hərbi Məktəbi bitirdikdən sonra təyinatla “N” saylı hərbi hissədə Yanacaq Sürtgü Materialları xidməti rəisi vəzifəsində işləyib (1999-2002). 2002-ci ildən hal hazıra kimi “N” saylı hərbi hissədə Yanacaq Sürtgü Materialları saxlama bölməsi rəisi vəzifəsində işləyir.

Internet istifadəçiləri üçün ilk dəfə Faxralı kəndinin **www. Faxrali.info** ünvanlı saytının yaradılmasının təşəbbüskarı və yaradıcısı olub. “Unutmayaq ki, unudulmayaq” kitabının müəl lifidir.

Aldığı rütbələr leytenent (1999-2001), baş leytenant (2001-2003), kapitan (2003-2008), mayor (2008-).

2004-cü ildə **“Azərbaycan Respublikası Silahlı Qüvvələrin 10 illyi (1991-2001)”** yubiley, 2006-cı ildə **“Qüsursuz Xidmətlərə**

**Görə”** III dərəcəli, 2008-ci ildə **“Azərbaycan Respublikası Silahlı Qüvvələrinin 90 illiyi (1918-2008)”** yubiley medalları ilə təltif olunub. Hal hazırda hərbi xidmətdədir. II dərəcəli məharət dərəcəsi var. Iki övladı var.



**Xurşudov Zamiq Fərman oğlu** 17 sentyabr 1984-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi qurtardıqdan sonra Azərbaycan Beynəlxalq Universitetinin Hüquq fakültəsinə qəbul olub və həmin universitetin “Hüquqşunas” ixtisasına yiyələnib (2002-2006). 2008-ci ildən hal-hazıra kimi Azərbaycan Respublikası Prezidenti Yanında Xüsusi Tibb Xidməti Mərkəzi Klinik Xəstəxanasında hüquqşünas işləyir.



**İbrahimov Kərəm Cəlal oğlu** 1960-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1967-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə daxil olub və 1977-ci ildə Balakən rayonu Qaravəlli kənd orta məktəbinin onuncu sinfini bitirib. 1977-ci ildən 1978-ci ilə qədər Qasım İsmayılov (indiki Goranboy) rayonunun K. Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozunda sıravi kolxozçu işləyib. 1978-1983-cü illərdə Baki Dövlət Universitetinin “mexanika riyaziyyat” fakültəsində ali təhsil alıb. İnstitutda oxuduğu illərdə Zaqafqaziya Komsomol məktəbini əla qiymətlərlə bitirib. İctimai işlərdə fərqləndiyinə görə dəfələrlə müxtəlif hədiyyə və tərifnamələrlə təltif olunub. 1983-cü ildə təyyinatla Azərbaycan Respublikası Nazirlər Kabineti yanında Yanğından Mühafizə Cəmiyyətində mühəndis vəzifəsinə təyin olunub. 1987-ci ilə qədər orada böyük mühəndis vəzifəsində çalışıb. 1987-ci ildə göndərişlə Daxili İşlər Nazirliyinin Əsaslı Tikinti şöbəsinə texniki nəzarət mühəndisi vəzifəsinə təyin edilib və həmin idarədə Komplektləşdirmə Şöbəsi rəisi vəzifəsinə qədər yüksəlib. Daxili İşlər Nazirliyi tərəfindən cəbhə bölgələrində inşa olunan bir sıra inzibati binaların və mühəndis qurğularının mal-material və avadanlıqlarla təchiz

olunaraq istismara verilməsində fəal iştirak edib. Həmin idarədə baş mühəndis vəzifəsinə qədər yüksəlib. 1998-2004-cü illər ərzində Nərimanov rayonunun Mühafizə İdarəsində taqım komandiri, baş növbətçi inspektor vəzifələrində çalışıb. 1999-cu ildə Azərbaycan Respublikası Daxili İşlər Nazirliyinin Polis Akademiyasını bitirərək hüquqşünas ixtisasına yiyələnib. 2004-cü ildən Baş Mühafizə İdarəsinin Təşkilati İnspektor İdarəsində inspektor, baş inspektor vəzifələrində çalışıb. 2007-ci ildən Təşkilati İnspektor Şöbəsində Nəzarət-Əlaqələndirmə və İnspektorluq Bölməsinin rəisi, həmin şöbənin rəis müavini və Təşkilati Analitik bölməsinin rəisi vəzifəsində çalışıb. 2009-cu ildən DİN-in Baş Mühafizə İdarəsinin Növbətçi Hissələri İdarəetmə Xidmətinin rəisi vəzifəsində xidmət edir. Polis polkovnikidir. Daxili İşlər Nazirliyinin **“Qüsursuz xidmətlərə gorə”** 3-cü və 2-ci dərəcəli medalı ilə təltif olunub. İki övladı var.



**İsmayılov Rəşad Məmmədyar oğlu** 6 noyabr 1977-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1984-cü ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1995-ci ildə həmin məktəbin 11-ci sinfini bitirib. 1996-cı ilin yanvar ayının 29-u Goranboy rayon hərbi komisarlığı tərəfindən həqiqi hərbi xidmətə çağrılıb və Ədliyyə Nazirliyinin “N” saylı mühafizə alayında müddətli həqiqi hərbi xidmətə başlayıb. 21 avqust 1997-ci ildə həqiqi hərbi xidmətdən ehtiyata buraxılıb. Öz ərizəsi ilə müddətdən artıq üç illik həqiqi hərbi qulluqçu kimi 1 sentyabr 1997-ci ildən Ədliyyə polisi “N” saylı mühafizə alayının 10-cu bölüyündə kiçik çavuş hərbi rütbəsi ilə baş texnik-qrup rəisi vəzifəsində xidmətini davam etdirib. 27 may 1998-ci ildə müddətdən artıq çavuş hərbi rütbəsi və 19 mart 1999-cu il baş çavuş hərbi rütbəsi verilib. 2000-ci il sentyabr ayının 21-də müqaviləsinin başa çatması ilə əlaqədar ordu sıralarından tərxis olunub. 29 may 2001-ci il tarixində Mülki Müdafiə İdarəsi rəisinin əmri ilə “N” saylı hərbi hissənin qəza-bərpa taborunun mühəndis texniki bölüyünün sürücü-texnik vəzifəsinə təyin edilb. 11 dekabr 2006-cı il Fövqəladə Hallar Nazirinin əmrinə əsasən Mülki Müdafiə Alayının mənzil-istismar

xidməti rəisi vəzifəsinə təyin edilib. 30 dekabr 2007-ci il Fövqəladə Hallar Nazirinin əmrinə əsasən kiçik gizir hərbi rütbəsi verilib.

2008-ci il Fövqəladə Hallar Nazirinin əmrinə əsasən **“Azərbaycan Respublikası Silahlı Qüvvələrinin 90 illiyi (1918-2008)”** yubiley, 2008-ci il Azərbaycan respublikasının prezidentinin fərmanına əsasən **“Hərbi Xidmətlərə Görə”** və 2008-ci il Fövqəladə Hallar Nazirinin əmrinə əsasən **“Qüsursuz Xidmətə Görə”** 3-cü dərəcə medalları ilə təltif olunub. Hal-hazırda “N” saylı hərbi hissənin Mənzil İstismar Xidməti rəisi vəzifəsində xidmətini davam etdirir. İki övladı var.



**İsmayılov Sərxan Əlisa oğlu** 21 sentyabr 1972-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1979-cu ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1990-cı ildə həmin məktəbin onuncu sinfini bitirib. Orta məktəbi bitirdikdən sonra hərbi xidmətə çağrılıb. Hərbi xidmətini Almaniyada və Rusiyanın Buryatiya vilayətinin Ulan Ude şəhərində keçib (1990-1992). Hərbi xidmət keçdikdən sonra fərdi fəaliyyətlə məşğul olub (1992-1995). 1995-ci ilin yanvar ayından Yevlax şəhəri Polis Şöbəsində milis nəfəri kimi polis orqanlarında əmək fəaliyyətinə başlayıb. 1996-cı ildə Azərbaycan Respublikası Polis Akademiyasına qəbul olub və 2000-ci ildə oranı “hüquqşünas” ixtisası üzrə başa vurub. 2000-ci ildə təyinatla Goranboy rayonunun Polis Şöbəsində Narkotiklərlə Mübarizə Qrupunun Əməliyyat Müvəkkili vəzifəsinə göndərilib, 2004-cü ildə Şəmkir rayon Polis Şöbəsində  Narkotiklərlə Mübarizə Qrupunun Baş Əməliyyat Müvəkkili vəzifəsində işləyib. 2005-ci ildən hal-hazıra kimi Tovuz rayon Polis Şöbəsində Cinayət Axtarış şöbəsinin rəisi vəzifəsində işləyir.

Aldığı rütbələr leytenant (2000-2002), baş leytenant (2002-2005), kapitn (2005-2008), mayor (2008-)

İşlədiyi illər ərzində insanların hüquqlarının pozulmasının qarşısını müvəvfəqiyyətlə aldığına görə bir neçə dəfə dövlət tərəfindən mükafatlandırılıb. 2008-cı ildə **“Qüsursuz Xidmətlərə Görə”** III dərəcəli medalı ilə təltif olunub. I dərəcəli məharət dərəcəsi var. Üç övladı var



**Quluyev Oktay İsgəndər oğlu** 07 noyabr 1946-cı ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirdikdən sonra (1953-1964) Azərbaycan Kənd Təsərrüfatı İnstitutuna qəbul olub və qiyabi "meyvə-tərəvəz və üzümçülük" ixtisası üzrə bitirib (1964-1971). 1971-1973-cü illərdə Bakı Ali Partiya məktəbini bitirib. Qasım İsmayılov rayon Partiya Komitəsinin büro üzvü və Komsomol Komitəsinin plenum üzvü seçilib (1970). Hərbi xidmətini SSRİ məkanında Çelyabinsk vilayətində keçirib (1973-1974). Qasım İsmayılov (indiki Goranboy) rayon Dəliməmmədli qəsəbəsi pambıq zavodunda fəhlə (1964-1965), Faxralı kənd sovetində (Faxralı, Alpout, Qurbanzadə kəndləri) mühasib (1965-1969), rayon Komsomol Komitəsində təlimatçı (1969), rayon Komsomol Komitəsində təşkilat şöbə müdiri (1969), rayon Komsomol Komitəsinin I katibi (1969-1971), rayon Partiya Komitəsində təlimatçı (1974-1976), rayon Daxili İşlər idarəsində siyasi işlər üzrə rəis müavini (1976-1991), rayon Todan milis bölməsində bölmə rəisi (1991), həmin bölmədə pasport xidməti rəisi (1991-1992), həmin bölmədə xidmət bölməsinin rəisi (1992-1993), Qasım İsmayılov rayon Dəliməmmədli Polis bölməsində pasport xidməti rəisi (1993-1996) vəzifələrində işləyib. Hal hazırda istefada olan polis mayorudur. Qarabağ uğrunda gedən döyüşlərdə Şuşa, Ağdərə və Gülüstan istiqamətlərində nankor ermənilərlə döyüşüb. Qarabağ müharibəsi veteranıdır. Dörd övladı var.



**Mehdiyev Şükür Nəcvəddin oğlu** 06 mart 1959-cu ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirib (1966-1977) və hərbi xidmətə çağrılıb (1977-1979). Daxili İşlər Nazirliyinin Polis Akademiyasını hüquqşünas ixtisası üzrə qiyabi bitirib (1991-1996). Milis nəfəri kimi Naftalan RDİŞ nəzdində Mühafizə Bölməsində işə başlayıb (1985-1987), 1987-ci

ildə N. Rzayev adına Bakı Xüsusi Orta Milis Məktəbinə qəbul olub və 1989-cu ildə həmin məktəbi bitirib, təyinatla bir ay müddətində Zəngilan RDİŞ YYÇ işləri üzrə inspektoru işlədikdən sonra, Qasım İsmayılov (indiki Goranboy) RDİŞ YYÇ işləri üzrə inspektoru (1989-1990), RDİŞ-də milis sahə inspektoru (1990-1992), Goranboy RDİŞ-də cinayət axtarış üzrə əməliyyat müvəkkili (1992-1993), Yevlax ŞPŞ-nin Cinayət axtarış bölməsində əməliyyat müvəkkili (1993-1994), Yevlax ŞPŞ-nin Cinayət axtarış bəlməsi rəisi (1994-1996), Gəncə ŞPİ-nin Mütəşəkkil Cinayətkarlıqla Mübarizə şöbəsinin rəisi (1996-1999), Gəncə şəhər Kəpəz RPŞ-nin rəisi (1999-2001), Goranboy RPŞ-nin xidmət üzrə rəis müavini (2001-2003), Şəmkir RPŞ-nin əməliyyat işi üzrə rəis müavini (2003-2005), Qazax RPŞ-nin rəsi (2005-2010) vəzifələrində inamla və qətiyyətlə çalışıb. 2010-cu ilin yanvar ayından Şəmkir RPŞ-nin rəisi vəzifəsində çalışır. O, polis polkovnikidir.

İşlədiyi illər ərzində insanların hüquqlarının pozulmasının qarşısını müvəffəqiyyətlə aldığına görə 27 dəfə dövlət tərəfindən mükafatlandırılmışdır. 2004-cü ildə **“Əla Xidmətlərinə Görə”** döş nişanı ilə təltif olunub. İki övladı var.



**Məmmədov Müzakir Alı oğlu** 15 sentyabr 1965-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra (1972-1982) hərbi xidməti Almaniya Federativ Respublikasında keçib (1983-1985). Azərbaycan Respublikası DİN-nin Polis Akademiyasını qiyabi bitirib (1999-2004).

Qasım Ismayılov (indiki Goranboy) rayonunun K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozunda kolxozçu (1985-1990), Azərbaycan Respublikasi DİN-nin Goranboy rayonunun polis şöbəsində polis nəfəri (1990-1996), Gəncə şəhər polis idarəsinin Mütəşəkkil Cinayətkarlıqla Mübarizə şöbəsində polis nəfəri (1996-1999), Gəncə şəhəri Polis İdarəsində İctimai Təhlükəsizlik şöbəsində Təbliğat-təşfiqat inspektoru (2005-2006), Qazax rayonunun Polis Şöbəsində Cinayət Axtarış bölməsində əməliyyat müvəkkili (2006-2010) vəzifələrində işləyib. 2010-cu ildən hal-hazıra kimi Şəmkir rayonunun Polis Şöbəsində Sahə rəisi vəzifəsində işləyir.

**"Qüsursuz Xidmətlərə Görə"** 3-cü və 2-ci dərəcəli medalları ilə təltif olub və Daxili İşlər Naziri tərəfindən **"Təşəkkür"** alıb (2009). İki övladı var.



**Nəzərov Anar Əhməd oğlu** 16 iyul 1968-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirib (1975-1985). K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda kolxozçu işləyib (1985-1986). 1986-cı ilin avqust ayında Yaroslavl Ali Hərbi Maliyyə məktəbinə qəbul olub. 1990-cı ilin mart ayında imtahandan kəsiri olduğu üçün Yaroslavl Ali Hərbi məktəbindən azad edilmiş və həmin məktəbin nəzdindəki gizirlər məktəbinə daxil olub, may ayında gizir rütbəsi alıb. 1990-cı ilin dekabr ayına qədər Mingəçevir şəhərində "N" saylı radiotexniki hərbi hissədə maliyyə xidməti rəisi vəzifəsində işləyib və sonra təhsilini davam etdirmək üçün yenidən Yaroslavl Ali Hərbi Maliyyə məktəbinin IV kursuna bərpa olmuşdur. 1991-ci ilin iyun ayında həmin məktəbin "hərbinin maliyyə təminatı" fakültəsini bitirərək "leytenant" rütbəsi almışdır. Lənkəran rayonunun Port İliç qəsəbəsində "N" saylı hərbi hissədə maliyyə xidməti rəisi (1991-1992), Füzuli rayonunda "N" saylı hərbi hissənin motoatıcı taborunda maliyyə xidməti rəisi (1992-1994), Azərbaycan Respublikası Müdafiə Nazirliyinin Maliyyə İdarəsinin "Pul təminatı və kreditlərin nəzarəti" şöbəsinin müfəttiş-təftişçisi, həmin şöbənin böyük müfəttişi (1994-2002), "N" saylı hərbi hissənin maliyyə xidməti rəisi (2002-2004), "N" saylı hərbi hissənin maliyyə xidməti rəisi (2004-2006) vəzifələrində işləyib. 2006-cı ildən hal hazıra kimi Heydər Əliyev adına Azərbaycan Ali Hərbi Məktəbində Maliyyə şöbə rəisi vəzifəsində xidmət edir.

Aldığı rütbələr leytenant (1991), baş leytenant (1993), kapitan (1996), mayor (1999), polkovnik-leytenant (2003).

2003-cü ildə **"Qüsursuz xidmətə görə"** III dərəcəli, 2004-cü ildə **"Azərbaycan Respublikası Silahlı Qüvvələrin 10 illiyi (1991-2001)"** yubiley, 2007-cı ildə **"Qüsursuz Xidmətlərə Görə"** II

dərəcəli medalları ilə təltif olunub. I dərəcəli məharət dərəcəsi var. İki övladı var.



**Sadıqov Arzu İsgəndər oğlu** 28 mart 1978-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1984-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1995-ci ildə həmin orta məktəbin 11-ci sinfini bitirib. 1995-ci ildə Azərbaycan Beynəlxalq Universitetinin hüquq fakültəsinin əyani şöbəsinə qəbul olub. 1999-cu ildə həmin universiteti qurtarıb, hüquqşünaslıq ixtisası alıb. 08 İyul 1999-cu ildə hərbi xidmətə gedib və 2000-ci ildə hərbi xidmətdən ehtiyata buraxılıb. 24 İyul 2004-cü ildə Xocalı rayon Məhkəməsində məsləhətçi vəzifəsinə təyin olunub. 16 İyul 2007-ci ildə məsləhətçi vəzifəsindən azad edilib və 31 İyul 2007-ci ildə Gəncə Apellyasiya Məhkəməsinə məsləhətçi vəzifəsinə təyin edilib və inzibati və-zifələrin altıncı təsnifatı üzrə 2-ci dərəcəli dövlət qulluqçusu ixtisası dərəcəsi verilib. Hal-hazırda həmin vəzifədə çalışır. Bir övladı var.



**Sadıqov Kaman Rafiq oğlu** 24 avqust 1972-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1979-cu ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1989-cu ildə həmin məktəbin onuncu sinfini bitirib. 1989-1990-cı illərdə istehsalat sahəsində işləyib. 1990-1992-ci illərdə hərbi xidmət keçib. 2001-2006-cı illərdə Rusiya Fedarasiyasının Nijni-Novqorod şəhərində Labaçevsk adına Dövlət Univesitetinin hüquq fakültəsində ali təhsil alıb və oranı hüquqşunas ixtisası üzrə bitirib. 2006-cı ildən Bakı şəhərində hüquq xidməti göstərən BSS LTD şirkətində mülki işlər üzrə səlahiyyətli nümayəndə kimi çalışır. Üç övladı var.

# MÜHARİBƏ VƏ ƏMƏK QƏHRƏMANLARI



**Musazadə Bəşir Göyüş oğlu** Sosialist Əməyi Qəhrəmanı, istehsalat qabaqcılı 15 fevral 1904-cü ildə Faxralı kəndində anadan olmuşdur. Azərbaycan Kənd Təsərrüfatı institutunu bitirmişdir. Kirovabad (indiki Gəncə) şəhəri hərbi komisarlığında, Qasım İsmayılov (indiki Goranboy) rayonundakı "28 Aprel" sovxozunda, Ağstafadakı 75 saylı Atçılıq zavodunda, Şəki rayonundakı Orconikidze adına taxılçılq sovxozunda, Azərbaycan SSR Sovxozlar Nazirliyində aqronom və s. vəzifələrində işləmişdir (1934-1968). 1968-ci ildən İttifaq əhəmiyyətli fərdi pensiyaçı olmuşdur. Taxılçılıq sahəsində yüksək əmək göstəricilərinə nail olmuş və **"Sosialist Əməyi Qəhrəmanı"** adına layiq görülmüşdü (1948). 1991-ci ildə vəfat edib və Bakı şəhərində ikinci fəxri xiyabanda dəfn edilib.

# MÜHARİBƏ VETERANLARI



**Abbasov Asəf Davud oğlu** 1967-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1974-cu ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə daxil olub və 1984-cu ildə həmin məktəbi bitirib. 1985-1986-ci illərdə Sovet ordusunda Əfqanıstanda xidmət edib. Əfqanıstan müharibəsi veteranıdır. 1988-ci ildə Azərbaycan İnşaat Mühəndislər İnstitutuna qəbul olub və 1992-ci ildə həmin institutu mühəndis ixtisası üzrə bitib. 1992-1996-ci illərdə Qarabağ uğrunda gedən döyüşlərdə iştirak etib. Qarabağ Müharibəsi veteranıdır. 1996-cı ildən hal-hazıra kimi Azərbaycan Vətən Müharibəsi Veteranları

Birliyinin Nizami rayonu şöbəsində sədr vəzifəsində işləyir. Respublika Veteranlar Birliyinin Rəyasət heyətinin üzvüdür. Üç övladı var. Bakı şəhərində yaşayır.

**Məmmədov Bəhlul Baba oğlu** Faxralı kəndində anadan olub. 1-ci Belarusiya cəhbəsində və 1941-ci ildə Rıjov şəhəri uğrunda gedən döyüşlərdə iştirak etmişdir. 1942-ci ildə yaralanaraq hospitala yerləşdirilib. Hospitaldan çıxdıqdan sonra Straxelko kəndinin azad edilməsi üçün mühüm tapşırıqda iştirak etmiş və "Döyüş xidmətlərinə görə" medalı ilə təltif olunmuşdur. Haqqında gələn məktubda yazılanlara əsasən növbəti döyüş tapşırığını yerinə yetirərkən Bəhlul kişi ağır yaralanıb və həkimlərin ciddi səylərinə baxmayaraq o, gözlərini əbədi olaraq yumub. Beş övladı var.

**Bayramov Bayram Qəhrəman oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib.



**Əhmədov Qurban Nəbi oğlu** 1905-ci ildə Faxralı kəndində anadan olub. Kolxozçu, briqadir olub. Böyük Vətən müharibəsi iştirakçısı olmuşdur (1941-1945). Krım uğrunda gedən döyüşlərdə sol çiyin nahiyyəsindən, ayağından və sol tərəfinin boşluğundan yaralanıbmış. I qrup mühari-bə əlil olub. Bir çox medal və ordenlərlə, o cümlədən **"SSRİ ŞQ 50 illiyi"** medalı (1969) ilə təltif olunub. 1970-ci ildə vəfat edib. Üç övladı var.

**Əhmədov Zakir Göyüş oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib.

**Əliyev Məhəmməd oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib.

**Hacıyev Lətif Nəsib oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib.



**Hüseyinov Kamil Taqil oğlu** 1909-cu ildə Qazax rayonunun Qədirli kəndində anadan olub. 3 illik təhsil alıb. Sonralar Faxralı kəndinə köçüb burada məskunlaşıb. Kolxozda kolxozçu işləyib. 1941-ci ildə hərbi xidmətdə 433-cü əlahiddə zenit artilleriya diviziyasında, sonra isə 1944-cü ildə 525-ci artilleriya polkunda artillerist rabitəçi kimi xidmət edib və 15 fevral 1945-ci ildə ağır yaralanaraq 1314 saylı hərbi hospitala yerləşdirilib. Hospitaldan çıxdıqdan sonra 1945-ci il may ayından 214-cü Boqdan-Xmelnitski qvardiya ordenli alayında çavuş manqa komandiri kimi xidmətini davam etdirib. 25 sentyabr 1945-ci ildə ordu sıralarından tərxis olunub və birinci dərəcəli uçota alınıb. 1941-1945-ci il Böyük Vətən Müharibəsi veteranı olub. **“Almaniya üzərində qələbə”** medalı ilə təltif olunub.



**Xoyluyev Mustafa İbrahim oğlu** 1910-cu ildə Faxralı kəndində anadan olub. Bakı şəhərində Maliyyə-kredit Texnikumunu bitirib (1930-1934). 1936-cı ildə Faxralı kənd K.Marks adına kolxozda Komsomol Təşkilatının katibi olmuşdur. II Dünya Müharibəsi iştirakçısıdır, Kuril adalarında hərbi xidmət keçib (1941-1945). II Dünya Müharibəsi veteranı olub. Müharibə illərindən sonra Qasım İsmayılov (indiki Goranboy) rayonunun Maliyyə Şöbəsinin sədri (1947-1956), Kənd İstehlakçılar Birliyinin sədri (1956-1957), Dimitri (Əzizbəyov kəndi) adına kolxozun sədri vəzifələrində işləmişdir (1957-1960). 1960-cı ildə vəfat edib. Yeddi övladı var.



**Xurşudov Mirzə Dövrüş** 1921-ci ildə Faxralı kəndində anadan olub. Böyük Vətən Müharibəsi iştirakçısı olub. 1941-ci ildə hərbi xidmətə çağrılıb. 1113-cü motoatıcı alayda (MAA) xidmətə başlayıb. 1941-1942-ci illərdə 1113-cü MAA tərkibində döyüşlərdə iştirak edib və həmin döyüşlərin birində 1942-ci ildə ayaq və qol nahiyyəsindən ağır yaralanaraq hospitala yerləşdirilib. Oradan isə tərxis olunub. Hərbi xidmətdə kimya kəşfiyyatı təyinatlı bölükdə təlimatçı olub. 2-ci

dərəcəli əlil və Böyük Vətən Müharibəsi veteranı olubmuş. Faxralı kolxozunda Həmkarlar ittifaqının və Kommunist partiyasının üzvü olub.

**"SSRİ ŞQ 50 illiyi"** (1969), **" Böyük Vətən Müharibəsi Qələbəsinin 30 illiyi"** (1975), **"Əmək veteranı"** (1981), **"SSRİ Silahlı Qüvvələrinin 70 illiyi"** (1988), **"Böyük Vətən Müharibəsi Qələbəsinin 60 illiyi"** medalları (2005) və **"Vətən müharibəsi"** 2 dərəcəli orden (1985) ilə təltif olunubmuş. 21 May 2006-cı ildə vəfat edib. Üç övladı var.



**Xurşudov Səməd Dövrüş oğlu** 1917-ci ildə Faxralı kəndində anadan olmuşdur. Kolxozçu olub. 1939-cu ildə hərbi xidmətə çağrılıb. Böyük Vətən Müharibəsində iştirak edib (1941-1945). Atıcı kimi Belarusiya Respublikasının Minisk şəhərində döyüşə başlamış və Berlinə qədər döyüş yolu keçmişdir. İki dəfə yaralanıb. Birinci dəfə Belarusiya respublikası uğrunda gedən döyüşlərdə, ikinci dəfə isə Berlin uğrunda gedən döyüşlərdə yaralanıbmış. Böyük Vətən Müharibəsi veteranı və I qrup əlil olmuşdur.

Narev çayının qərb sahilində **Şimali Varşava uğrunda**, **Modlin (Novoqeorqiyevsk) uğrunda**, **Torun uğrunda**, **Xoyneç (Kontiç)** və **Tuxolya (Tuxel) uğrunda** gedən döyüşlərdə Sovet İttifaqı Ali Baş Komandanı Marşal Stalin tərəfindən təşəkkürlər alıb. **"Döyüş Xidmətlərinə"** görə (1966), **"Böyük Vətən Müharibəsi Qələbəsinin 20 illiyi"** (1965), **"Əmək Veteranı"**, **"Böyük Vətən Müharibəsi Qələbəsinin 30 illiyi"** (1975), **"Böyük Vətən Müharibəsi Qələbəsinin 40 illiyi"**, **"SSRİ Silahlı Qüvvələrinin 60 illiyi"**, **"SSRİ Silahlı Qüvvələrinin 70 illiyi"**, **"Böyük Vətən Müharibəsi Qələbəsinin 50 illiyi"** (1995), **"Böyük Vətən Müharibəsi Qələbəsinin 60 illiyi"** (2005) medalları, **"Böyük Vətən Müharibəsi"** I dərəcəli ordeni və **"1941-1945-ci illər müharibəsi veteranı"** (1996) döş nisanı ilə təltif olunmuşdur. Üç övladı var.



**İsmayılov Elyar İsmayıl oğlu** 1959-cu ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1979-cu ildə Azərbaycan Texnologiya İnstitutuna daxil olub, hərbi xidmətə gedib və hərbi xidmətdən qayıdıb. 1987-ci ildə həmin İnstitutun "İçtimai İaşənin təşkili və texnologiyası" ixtisası üzrə mühəndis texnoloq ixtisasını bitirib. Təhsilini ala-ala 1982-ci ildən 1993-cü ilə qədər Goranboy rayonunun Faxralı kəndində Əmanət Bankının filialında müdir vəzifəsində işləyib. 1993-cü il oktyabr ayından 1996-cı il iyul ayına qədər Qarabağ və Azərbaycan Respublikasının ərazisi uğrunda gedən döyüşlərdə zabit kimi iştirak etib. 1996-cı ildən hal-hazıra qədər Gəncə Gil-Torpaq (Alüminium zavodu) istehsalat birliyində fəhlə işləyir. Dörd övladı var.

**Kosayev Yunus** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib.

**Qəhrəmanov Qüdrət Vəli oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib.



**Quluyev İsgəndər Bədir oğlu** 1916-cı ildə Faxralı kəndində anadan olub. Faxralı kənd yeddillik məktəbini bitirdikdən (1925 -1932) sonra Qasım İsmayılov rayonunun Safıkürd orta məktəbinin on illiyini (1932-1935) bitirib. 1935-1938-ci illərdə Kirovabad (indiki Gəncə) Kənd Təsərrüfatı texnikumunda təhsil alıb. 1939-cu ildə hərbi xidmətə çağrılıb və Böyük Vətən Müharibəsinin iştirakçısı olub (1941-1945). Krım uğrunda gedən döyüşlərdə hava hücumundan müdafiə dəstələri tərkibində döyüş yolu keçmişdir. Azərbaycan Kənd Təsərrüfat İnstitunu qiyabi olaraq bitirərək (1949-1954) "aqronom" ixtisasına yiyələnmişdir.

Qasım İsmayılov (indiki Goranboy) rayonunun Dəliməmmədli qəsəbəsi MTS-də baş aqronom (1952-1954), Qasım İsmayılov

rayonunun Telman adına kolxozunda (Hazırəhmədli kəndi) kolxoz sədri (1954-1956), Qasım İsmayılov rayonunun Dəliməmmədli qəsəbəsində taxıl tədarükü idarəsinin müdiri (1956-1959), Qasım İsmayılov rayonunun Dəliməmmədli qəsəbəsi Pambıq zavodunda əmtəənin qəbulu şöbəsinin müdiri (1959-1960) Qasım İsmayılov rayonunun K.Marks adına kolxozunda (Faxralı, Alpout, Qurbanzadə kəndi) baş aqronom (1960-1983) və aqronom (1983-1985) vəzifələrində işləmişdir. Doqquz övladı var. 1998-ci ildə vəfat edib.

Sovet İttifaqı Ali Baş Komandanı Marşal Stalin tərəfindən təşəkkürlər alıb. **“ Böyük Vətən Müharibəsi Qələbəsinin 20 illiyi”** (1965), **“Əmək Veteranı”**, **“Böyük Vətən Müharibəsi Qələbəsinin 30 illiyi”** (1975), **“Böyük Vətən Müharibəsi Qələbəsinin 40 illiyi”**, **“SSRİ Silahlı Qüvvələrinin 60 illiyi”**, **“SSRİ Silahlı Qüvvələrinin 70 illiyi”**, **“Böyük Vətən Müharibəsi Qələbəsinin 50 illiyi”** (1995) medalları ilə təltif olunmuşdur. Doqquz övladı var.

**Qurbanov Məmməd Məmməd oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib. Beş övladı var.

**Mamedov Mansur Mədət oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib.



**Maşıyev Mirzə Binnət oğlu** 1921-ci ildə Samux rayonunun Qaraağaclı kəndində anadan olub. Ailə qurub və 1956-cı ildən Faxralı kəndində yaşayıb. 1937-ci ildə Dəliməmmədli qəsəbəsində Texniki Peşə Məktəbini Baytar texnik ixtisası üzrə bitirib və Samux rayonunda baytar həkim işləyib. 1940-cı ildə hərbi xidmətə gedib. Böyük Vətən Müharibəsində 147 saylı atıcı qvardiyasının tərkibində Volqaqıradın Kamışın deyilən ərazisində döyüşlərdə iştirak edib. 1944-cü ildə döyüşlərin birində sol ayağından yaralanaraq hospitala yerləşdirilib və oradan da ordu sıralarından tərxis edilib. Tərxis edildikdən sonra 1955-ci ilə kimi tut meşəsində xəzinədar, sonralar isə K.Marks adına kolxozda suçu işləyib. O, həmkarlar ittifaqının üzvü və Böyük Vətən Müharibəsi Veteranı olmuşdur.

**“Böyük Vətən Müharibəsi Qələbəsinin 20 illiyi”** (1965), **“Əmək Veteranı”**, **“ Böyük Vətən Müharibəsi Qələbəsinin 30 illiyi”** (1975), **“ Böyük Vətən Müharibəsi Qələbəsinin 40 illiyi”**, **“SSRİ Silahlı Qüvvələrinin 60 illiyi”**, **“SSRİ Silahlı Qüvvələrinin 70 illiyi”**, **“Böyük Vətən Müharibəsi Qələbəsinin 50 illiyi”** (1995) medalları, **“Sosialist Yığıncağının Qələbəsi”** döş nişanı və **“Vətən Müharibəsi”** 2-ci dərəcəli ordeni (1985) ilə təltif olunmuşdur. 1982-ci ildə **SSRİ Xalq Təsərrüfatının inkişafında** göstərdiyi nailiyyətlərinə görə bürünc medalla təltif edilmişdir. 03 dekabr 1997-ci ildə vəfat edib.

**Məmmədov Rza İsmayıl oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib. Yeddi övladı var.

**Məmmədov Məhəmmədəli** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib.



**Məhərrəmov Hüseynalı Məmməd oğlu** 1922-ci ildə Faxralı kəndində anadan olmuşdur. 1941-1945-ci ildə Böyük Vətən müharibəsi iştirakçısı olub. Sevastopol uğrunda gedən döyüşlərdə 1942-ci ildə iştirak edib, Djestrovskda 1944-cü ildə döyüşüb, 1942-ci ildə döyüşlərdə yaralanıb. Xidmət etdiyi vaxtlarda bərbərlik edib. Döyüşlərdə 747-ci motoatıcı alayın, 172-ci, 322-ci və 255-ci motoatıcı divizyaların tərkibində atıçı kimi xidmət edib.

Böyük Vətən Müharibəsindən sonra Faxralı kəndində uzun illər dəlləklik və bərbərlik edib.

**“Almaniya üzərində qələbə”**, **“Böyük Vətən Müharibəsi Qələbəsinin 20 illiyi”** (1965), **“Əmək Veteranı”**, **“Böyük Vətən Müharibəsi Qələbəsinin 30 illiyi”** (1975), **“Böyük Vətən Müharibəsi Qələbəsinin 40 illiyi”**, **“SSRİ Silahlı Qüvvələrinin 60 illiyi”**, **“SSRİ Silahlı Qüvvələrinin 70 illiyi”**, **“Böyük Vətən Müharibəsi Qələbəsinin 50 illiyi”** (1995) medalları və **“Vətən Müharibəsi”** 2-ci dərəcəli ordeni (1985) ilə təltif olunmuşdur.

**“Komminist əməyi zərbəçisi”** döş nişanına layiq görülmüşdür (1984). On bir övladı var.

**Məhərrəmov Qədir Məmməd oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib.

**Məmmədov Köçəri Baba oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib.

**Musayev Həmdulla Əli oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib. On övladı var.



**Məmmədov Əliquzu Abbas oğlu** 1925-ci ildə Faxralı kəndində anadan olmuşdur. 1942-ci ildə Böyük Vətən Müharibəsində Belarusiya cəbhəsində döyüşmüşdür. 1943-cü ildə döyüşlərdə yaralanaraq hospitala yerləşdirilib və oradan da tərxis edilib. 1943-cü ildən 1986-cı ilə kimi Faxralı kəndində poçtalyon işləyib. **“Böyük Vətən Müharibəsi Qələbəsinin 30 illiyi”** (1975), **“Böyük Vətən Müharibəsi Qələbəsinin 40 illiyi”**, **“SSRİ Silahlı Qüvvələrinin 60 illiyi”**, **“SSRİ Silahlı Qüvvələrinin 70 illiyi”** medalları ilə təltif edilib. **“Komminist əməyi zərbəçisi”** döş nişanına layiq görülmüşdür (1984). Vəfat edib. Yeddi övladı var.

**Musayev İsa Məmməd oğlu** 1905-ci ildə Faxralı kəndində anadan olub. Kolxozçu olub. Böyük Vətən müharibəsi iştirakçısı olub (1942-1945). Atıcı olaraq Stalinqrad döyüşlərində iştirak edib. Leninqradın mühasirəsinin dağıdılmasında iştirak edib. Müharibə veteranı olub. Bir neçə orden və medallarla təltif olunub. 1964-cü ildə vəfat edib. Altı övladı var.



**Musayev Qurban Qasım oğlu** 12 dekabr 1921-ci ildə Faxralı kəndində anadan olmuşdur. Faxralı kənd yeddiillik məktəbini bitirmişdir. 1941-ci ildə hərbi xidmətə çağrılıb və 1942-ci ildə ehtiyatda olan 88-ci motoatıcı

alayın tərkibində manqa komandiri, 1943-cü ildə atıcı alayda manqa komandirnin köməkçisi, 58-ci əlahiddə atıcı diviziyanın tərkibində baş çavuş və 1944-cü ildə 312-ci ehtiyatda olan atıcı alayın tərkibində taqım komandirinin müavini olub. 1942-1943-cü illərdə 58-ci əlhahiddə atıcı diviziyasının tərkibində bölüyün baş çavuşu kimi Böyük Vətən Müharibəsi döyüşlərində iştirak etmişdir. Döyüşlərin birində Alman faşistləri tərəfindən əsir götrülən Qurban kişi əsirlikdən qaçmağa müvəffəq olub. 1941-1945-ci il Böyük Vətən Müharibəsi veteranıdır.

**"Böyük Vətən Müharibəsi Qələbəsinin 20 illiyi"** (1965) medalı və digər medallar ilə təltif olunmuşdur. Beş övladı var. 27 mart 1972-ci ildə vəfat edib.

**Musayev Qəzənfər Əli oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib. Yeddi övladı var.

**Mustafayev Mehralı Məhəmməd oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib.

**Mustafayev Mustafa İslam oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib. Səkkiz övladı var.



**Nəbiyev Qənbər Əli oğlu** 1920-ci ildə Faxralı kəndində anadan olmuşdur. O, kolxozçu olub. Böyük Vətən Müharibəsində iştirak edib (1941-1945). Atıcı kimi Krım istiqamətində gedən döyüşlərdə iştirak etmişdir. Berlinin alınması uğrunda gedən döyüşlərdə əsir düşübmüş. İki gün əsirlikdə olduqdan sonra yoldaşları ilə əsirlikdən qa-çıb. Böyük Vətən Müharibəsi veteranı olub. **"Böyük Vətən Müharibəsi Qələbəsinin 20 illiyi"** (1965), **"Böyük Vətən Müharibəsi Qələbəsinin 40 illiyi"** (1981), **"SSRİ Silahlı Qüvvələrinin 50 illi-yi"**, **"SSRİ Silahlı Qüvvələrinin 60 illiyi"**, **"Əmək Veteranı"** medalları və **"Böyük Vətən Müharibəsi"** II dərəcəli ordeni ilə təltif olunmuşdur. Vəfat edib. Dörd övladı var.

**Rəsulov Həsən Vəli oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib.

**Rüstəmov Qələndər Məhərrəm oğlu** 1941-1945-ci illərdə Böyük Vətən müharibəsində iştirak edib.

**Sadıqov Hasan Məmməd oğlu** 1904-cü ildə Ermənistan respublikası Basarkeçər rayonunun Qaraiman kəndində anadan olmuşdur. 1918-ci ildə mənfur ermənilərin törətdikləri vəhşiliklər nəticəsində bir çox azərbaycanlılar kimi Hasan kişi də ailəsi ilə öz



ata-baba yurdlarından didərgin düşərək Goranboy rayonunun Faxralı kəndində məskunlaşıb. O, kolxozçu olub. Böyük Vətən Müharibəsində iştirak edib (1941-1944). Şimali Qafqaz istiqamətində və I Ukrayna cəbhəsində döyüşüb. Rostov uğrunda gedən döyüşlərdə 1942-ci ildə güllə yarası alıb və sağaldıqdan sonra döyüşlərə qatılan Hasan kişi növbəti dəfə 1943-cü ildə Minitoplda mina partlayışı zamanı sağ ayağından qəlpə yaraları almışdır. 1944-cü ildə ordu sıralarından tərxis olunmuşdur. Müharibə veteranı və II qrup əlil olubmuş. 1988-ci ildə vəfat edib.
**"Böyük Vətən Müharibəsi Qələbəsinin 20 illiyi"** (1965), **"Böyük Vətən Müharibəsi Qələbəsinin 30 illiyi"** (1976), **"Böyük Vətən Müharibəsi Qələbəsinin 40 illiyi"** (1986), **"SSRİ Silahlı Qüvvələrinin 60 illiyi"** (1978), **"SSRİ Silahlı Qüvvələrinin 70 illiyi"** (1988), **"Əmək Veteranı"** medalları və **"Böyük Vətən Müharibəsi"** I dərəcəli ordeni ilə təltif olunmuşdur. Səkkiz övladı var.



**Süleymanov Abdulla Hadı oğlu** 1924-cü ildə Faxralı kəndində anadan olmuş və 1941-1945-ci illərdə Böyük Vətən Mühüribəsində iştirak etmişdir. II Dünya Müharibəsinin veteranı olub. K.Marks adına kolxozda uzun müddət baş mühasib işləmişdir.
**"Böyük Vətən Müharibəsi Qələbəsinin 20 illiyi"** (1965), **"SSRİ Silahlı Qüvvələrinin 50**

**illiyi”** (1969), əməkdə göstərdiyi şücaətə görə **“V.İ.Leninin 100 illiyi”** yubiley medalları, **“Sosialist Yığıncağının Qələbəsi”** nişanı (1976) **“Böyük Vətən Müharibəsi Qələbəsinin 30 illiyi”** (1976), **“SSRİ Silahlı Qüvvələrinin 60 illiyi”** (1978), “**Böyük Vətən Müharibəsi Qələbəsinin 40 illiyi”** (1985), **Böyük Vətən Müharibəsi Qələbəsinin 70 illiyi”** (1988) medalları və **“Böyük Vətən Müharibəsi”** I dərəcəli ordeni ilə təltif olunmuşdur. 27 dekabr 1992-ci ildə vəfat edib. Səkkiz övladı var.

# MÜXTƏLİF SƏNƏT ADAMLARI



**Abbasov Balakişi Davud oğlu** 03 avqust 1965-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirdikdən sonra (1972-1982) Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun Aqrokimya və Torpaqşünaslıq fakültəsinə daxil olub (1982). 1987-ci ildə həmin institutu bitirib təyinat ilə Qasım Ismayılov rayonunun K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozuna pambıqçılıq briqadası briqadiri vəzifəsinə təyin edilib. 1989-cu ildə qabaqçıl pambıqçı kimi Rayon Partiya Komitəsinin diplomuna layiq görülmüşdür və Kommunist partiyası-nın sıralarına qəbul edilmişdir. Kolxozun ümumi yığıncağında kolxoz təftiş komissiyasının sədri seçilmş (1992-1998) və sonra kolxozun xəzinədarı vəzifəsində işləmişdir (1999). Birinci bəldiyyə seçkilərində Faxralı kənd bələdiyyəsinə üzv seçilib və bələdiyyə sədrinin müavini təyin edilib (1999-2005). 2006-cı ilin aprel ayından hal hazıra kimi Goranboy rayon Poçt Filialının Faxralı Poçt şöbəsinin rəisi vəzifəsində işləyir. İki övladı var.



**Əfəndiyev Azad Davud oğlu** 1960-cı ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1967-ci ildə həmin rayonun Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1977-ci ildə orta məktəbin onuncu sinfini bitirib. Məktəbi bitirdikdən sonra Kirovabad (indiki Gəncə) şəhərində Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunun Kirovabad filialına daxil olub. 1982-ci ildə həmin İnstitutun "Dəri məmulatları texnologiyası" ixtisası üzrə tam kursu bitirib, təyinatla Rusiyanın Yaroslavl şəhərinin "Severoxod" birliyinə işləməyə göndərilmişdir. Orada usta vəzifəsindən sex rəisi vəzifəsinə qədər yüksəlmişdir. 1982-1984-cü illərdə SSRİ SQ tərkibində Ukraynada hərbi xidmətdə olub. Hərbi xidməti bitirdikdən sonra yenidən həmin birlikdə işini davam etdirib. 1988-ci ildə Azərbaycana qayıdıb 1 № li ayaqqabı fabrikində baş usta vəzifəsindən təchizat şöbəsinin rəisi vəzifəsinə qədər yüksəlib. 1995-1996-cı illərdə Azərbaycan Dövlət Əməyin Mühafizəsi və Təhlükəsizlik Texnikası Elmi-Tətqiqat İnstitutunun ümumi işlər üzrə müdiri, 1996-1999-cu illərdə yenidən 1 №-li ayaqqabı fabrikində Təchizat və Satış üzrə şöbə rəisi, 1999-2003-cü illərdə "Bakı Ayaqqabı-2" ATSC-də İdarə heyətinin sədri, 2003-2006-cı illərdə "Saxsı Qablar" ASC-də icraçı direktor vəzifələrində işləyib. Hal-hazırda "Ağac Yonqarları Plitəsi" ASC-nin baş direktoru vəzifəsində işləyir. Ukrayna Texnologiya Akademiyasının Akademik dərəcəsini alıb. İkinci təhsil kimi Azərbaycan İqtisad Universitetinin Maliyyə Kredit fakültəsini bitirib. Iki övladı var.



**Əfəndiyev Ramiz Yaqub oğlu** 20 noyabr 1939-cu ildə Faxralı kəndində anadan olmuşdur. 1958-ci ildə Azərbaycan Kənd Təsərrüfatı institutuna daxil olmuş və 1963-cü ildə oranın kənd təsərrüfatının mexanikləşdirilməsi ixtisasını tam kursu üzrə bi-tirmişdir. Dövlət imtahan komissiyasının 1963-cü il tarixli qərarı ilə ona "mühəndis mexanik" ixtisası verilmişdir. 1963-cü ildən

Qasım İsmayıov (indik Goranboy) rayonunun 2 saylı texniki peşə məktəbində müəllim işləmişdir. 1965-ci ildən Faxralı kənd xalq deputatları sovetinin deputatı seçilmişdir. Yaxşı işlədiyinə görə Qızıl Hacılı kəndinə baş mühəndis göndərilmişdir. İşlədiyi müddətdə bir neçə yubiley medalları ilə təltif olunmuşdur. 02 avqust 2005-ci ildə vəat edib. Beş övladı var.



**Əhmədov Fəqani Şəmil oğlu** 17 fevral 1954-cü ildə Qasim İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi qurtarandan sonra (1961-1971) K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda kolxozçu işləyib (1971-1973). Hərbi xidməti SSRİ SQ Hava Hücumundan Müdafiə Qoşunlarında keçib (1973-1975). Hərbi xidmətdən qayıtdıqdan sonra 1975-ci ildə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun Mexanikləşdirilmə fakültəsinin "Mühəndis Mexanik" ixtisasına qəbul olub və 1980-ci ildə institutu həmin ixtisas üzrə fərqlənmə diplomu ilə bitirib. 1980-ci ildə təyinatla İsmayıllı rayon Üzümçülük Komitəsi Aqrar İstehsalat Birliyində kənd təsərrüfatı üzrə mühəndis vəsifəsinə təyin olunub. İsmayıllı rayonunun Kənd Texniki Təminat Birliyində Baş Mexanik (1981-1993), İsmayıllı rayonunun Kənd Texniki Təminat Birliyində müdir (1983-1984), Qasım İsmayılov rayonunun Kənd Texniki Təminat Birliyində baş mühəndis (1984-1987), Qasım İsmayılov rayonunun Aqrara Sənaye Birliyində baş mühəndis (1987-1999), Goranboy rayonunun Enerji Paylayıcı Şəbəkəsində Satış şöbə rəisi (2000-2001), fərdi fermer təsərrüfatında müdir (2001-2006) və Goranboy rayon Qaz İstismar İdarəsində baş mühəndis (2006-2009) vəzifələrində işləyib. Hal-hazırda Goranboy rayonunun Qaz İstismar İdarəsində rəis müavinidir.

Öz işi ilə yanaşı Fəqani müəllim bir çox ictimai vəzifələrin öhdəsindən bacarıqla gəlib. O, tələbəlik illərində fakultənin ilk partiya təşkilatının katibi (1975-1980), İsmayıllı rayon partiya komitəsinin plenum üzvü (1983-1984), idarə partiya təşkilatının sədri (1983-1984), Qasım İsmayılov rayonunun Qızılhacılı qəsbəsinin deputatı (1986-1991) olub. Hal-hazırda Goranboy rayonunun Qaz İstismar sahəsində Yeni Azərbaycan Partiyası təşkilatının sədridir. 2

dəfə Ümumiittifaq Xalq Təsərrüfatı sərgisinin nümayəndəsi olub (1984,1988). "Beşilliyin Qalibi" döş nişanı ilə təltif olunub (1988). Dörd övladı var.



**Əhmədov Ziyat Ələs oğlu** 03 may 1964-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1971-ci ildə Faxralı kənd orta məktəbinin birinci sinfinə daxil olub və 1981-ci ildə həmin məktəbin onuncu sinfini bitirərək elə həmin ildə, Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun "Bitki mühafizəsi" fakültəsinə qəbul olunub. 1986-cı ildə həmin institutu əyani olarq tam kurs üzrə bitirib və alim aqronom ixtisasına yiyələnib. 1986-cı ildən 1987-ci ilə kimi Azərbaycan Respublikası Kənd Təsərrüfatı Nazirliyinin Goranboy rayonunun Aqrar Sənaye Birliyində aqronom, müfəttiş (1987-1993) və Goranboy rayonunun Bitki Mühafizəsi Mərkəzinin rəisi (1993-2007) vəzifələrində işləyib. 2007-ci ildən hal-hazıra kimi Azərbaycan Respublikası Dövlət Torpaq və Xəritəçəkmə Komitəsinin Goranboy rayon şöbəsinin müdiri vəzifəsində işləyir. Üç övladı var.



**Hacıyev Camal Usub oğlu (Qaçaq Camal)** 1883-cü ildə Faxralı kəndində anadan olmuşdur. Qeyri adi fiziki gücü, sərrast atəş açmaq, at minməyi və şeir yazmağı vardır. O, qoçaqlığı və mərdliyi ilə Gəncəbasarda və uzaq ellərdə böyük adsana malik olmuşdur. Deyilənlərə görə Gəncə Karvansarayına bir Ləzgi pəhləvan gəlibmiş və burada bir çox pəhləvanlara meydan oxuyurmuş. Bu haqda eşidən Camal yaylaqdan enib pəhləvanla şavaşmaq qərarını verib. Savaş meydanı düzənlənib və ləzgi pəhləvan bu zaman Camala lağda edib ki, belə cələf adam mənə nə edəcək. Savaş başlayan kimi Camal əllərini pəhləvanın qabırğalarına keçirərək onu yerə sərib və oranı sakit halda tərk edib. Camal hər zaman fağır-füqarəyə arxa dayaq olarmış. Haqqı nahaqqa verməzmiş. Kasıb-kusuba zülm edənlərə qarşı daim mübarizə aparıb. Sovet höküməti yarananda hökütməti dəstəkləməsinə baxmayaraq Camal hökümət

tərəfindən edilən haqsızlıqların qarşısını alıb. Camalın vaxtında Faxralılar heç bir təsirə məruz qalmayıblar. Qaçaq Məmmədqasımla, Patavalı Hüseynlə, Qandal Nağı ilə, Teymur Quliyevlə və zamanının bir çox qoçaqları ilə dostluğu olub. Çörəkli, qonaqpərvər kişi imiş, Camal. Hətta Qaçaq Nəbi İrana səfər edərkən Faxralı kəndində Qaçaq Camalın qonağı olub. Həmin vaxt igidlər arasında xayatı (müəyyən məsafədə ağ və qara saplardan hazırlanmış nişan alma yeri) yarışı keçrilib və bu yarışın qalibi sərrast atıcı Faxralı Camal olub. Camalın şöhrəti getdikcə artdığından, bir çoxlarının ona qarşı qısqanclıqdan doğan nifrətləri də artıb və onu öldürmək qərarına gəliblər. Camalı üzbəüz öldürmək mümkün olmadığından, 1931-ci ildə onun atını oğurlayaraq ona tələ qurublar. Atının dalınca dəstə üzərinə tək gedən Camalı, atışma zamanı arxadan namərdcəsinə güllə ilə vurublar. Aldığı güllə yarasından Camal yerindəcə vəfat edib. XX əsrin əvvəllərində adı dillər əzbəri olan Faxralı Camal Faxralı kənd qəbristanlığında dəfn edilib.



**Həmidov Polad Cabir oğlu** 26 yanvar 1978-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1984-cü ildə Faxralı kənd orta məktəbin birinci sinfinə gedib, 1995-ci ildə həmin orta məktəbin 11-ci sinfini bitirib. 1995-ci ildə H.Zərdabi adına Gəncə Dövlət Pedaqoji İnstutunun "Kimya Biologiya" fakultəsinin "Kimya" ixtisasına daxil olub. 1999-cu ildə Gəncə Dövlət Pedaqoji Universtetinin Kimya ixtisasını "Bakalavr" dərəcəsi ilə bitirib. 1999-2001-ci illərdə hərbi xidmətdə olub. 2002-ci ildən 2006-cı ilə kimi Goranboy rayonunun Yəhərçi-Qazaxlar kəndinin H.Sarıyev adına orta məktəbində kimya fənni üzrə müəllim kimi işləyib. Hal-hazırda video-foto operator kimi fəaliyyət göstərir. İki övladı var.



**Həmidov Ziyafəddin Vahid oğlu** 24 avqust 1957-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1964-cü ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1974-cü ildə həmin məktəbin 10-cu sinfini bitirib. 1976-1978-ci illərdə Novosibirsk-

də hərbi xidmətdə olub. 1978-ci ildə H. Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnistitutunun Tarix fakültəsinə yüksək qiymətlərlə qəbul olub. 1982-ci ildə həmin fakültəni fərqlənmə diplomu və qızıl döş nişanı ilə bitirib. Təhsil aldığı dövrdə inistitutda yeni açılmış Beynəlxalq  icmal fakültəsinə daxil olub və həmin fakültənin 1 №-li fərqlənmə diplomuna layiq görülüb. 1982-ci ildə təyinatla Ucar rayonunun Xalac kənd orta məktəbinə tarix müəllimi vəzifəsinə göndərilib. 1985-ci ilə kimi orada işləyib. 1985-ci ildən Kirobabad (indiki Gəncə) şəhər Alüminium zavoduna işə qəbul edilib. Həmin müəssisədə iqtisadçı, çilingər, baş direktorun köməkçisi, satış üzrə mütəxəssis, sosioloq vəzifələrində işləyib. Hal-hazırda həmin müəssisədə texniki təhlükəsizlik və əməyin mühafizəsi  deportamentinə rəhbərlik edir və eyni zamanda Azərbaycan Metal İşçiləri Həmkarlar İttifaqı Federasiyasının həmin müəssisə üzrə təmsilçisi vəzifəsini aparır.

İnistitutda oxuduğu illərdə tarix fakültəsinin Tələbə Elmi Cəmiyyətinin sədri (1979-1982) və  İnstitutun Komsomol komitəsinin büro üzvü olub. Hazırda  Metal İHF-nin büro üzvüdür. 1981-ci ildə "Şəxsiyyətin formalaşmasında sosialist əməyinin rolu" mövzusundakı referat elmi işi respublikanın ali məktəbləri səviyyəsində 1-ci dərəcəli diploma və mükafata layiq görülmüşdür. Elmi rəhbəri H.Zərdabi adına Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutunun rektoru professor Şaiq Şıx-kərimov olmuşdur. Özünün dediyinə görə Faxralı kənd tarixi barəsində müəyyən araşdırmalar aparmış və bu sahədə yazdığı məqalələri Kirovabad Pedaqoji İnstitutunun "Yüksəliş" qəzetində, "Elm və Həyat" jurnalında çap olunmuşdur. Orta məktəbdə oxuduğu dövrlərdə "Mübariz" qəzetinədə ictimai işlərlə bağlı bir çox məqalələri çap edilmişdir. Təəssüf ki, Ziyafəddin müəllim bu məqalələrdən günümüzdə tapa bilmədiyindən heç birini təqdim edə bilmədi. Iki övladı var.



**Həsənov Şamxal Məhərrəm oğlu** 10 aprel 1984-cü il  Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı  kəndində  ziyalı ailəsində anadan olub. 1990-cı ildə  Goranboy rayonunun 1 saylı orta məktəbinin 1-ci sinfinə gedib və 2001-ci ildə həmin məktə-bin 11-ci sinfini bitirib. 2001-ci ildə Azərbaycan Kənd Təsərrüfatı Akademiyasının

“Aqrar İqtisadiyyat və Menecement” fakültəsinə daxil olub və 2005-ci ildə həmin Akademiyanı bitirib. 2005-ci ildən 2006-cı ilə kimi hərbi xidmətdə olub. 2006-cı ildən 2008-ci ilə kimi “Gəncə Regional Enerji Təchizat” MMC-nin Goranboy PEŞ-də mühəndis iqtisadçı və 2008-ci ildən 2010-cu ilə kimi İqtisadi İnkişaf Nazirliyi yanında Istehsalat Bazarına nəzarət üzrə Dövlət Xidmətinin Gəncə-Qazax region sektorunun böyük məsləhətçisi vəzifəsində işləyib. Hal-hazırda İqtisadi İnkişaf Nazirliyi yanında Antiinhisar Siyasəti və İstehlakçıların Hüquqlarının Müdafiəsi Dövlət Xidmətinin Gəncə-Qazax regional bölməsində böyük məsləhətçi vəzifəsində işləyir.



**Hüseynov Mülazim Calal oğlu** 12 aprel 1939-cu ildə Qasım İsmaylov (indiki Goranboy) rayonunun Faxralı kəndində kolxozçu ailəsində anadan olmuşdur. Uşaqlığı müharibə illərinə təsadüf etdiyindən ata nəvazişindən məhrum olan kiçik Mülazim 1946-cı ildə Faxralı kənd məktəbinin birinci sinifinə daxil olmuş və 1957-ci ildə oranı bitirmişdir. Hərbi xidmətini Rusiyanın Yakutiya vilayyətində üç il keçmişdir. 1960-cı ildə Kirovabad (indiki Gəncə) Politexnik Texnikumuna daxil olmuşdur. İlk iş fəaliyyətinə 1963-cü ildə Dəliməmmədli qəsəbəsi pambıq zavodunda başlamışdır. 1964-cü ildə 3 saylı radioverici mərkəzdə mantyor vəzifəsində işə başlamış və həmin mərkəzdə müxtəlif vəzifələrdə işləyərək oranın rəisi vəzifəsinə qədər yüksəlmişdir. 1968-ci ildə Moskva şəhərində rabitə institutuna daxil olmuşdur.

İşlədiyi müddətdə SSRİ rəhbərliyi tərəfindən bir cox orden, medallar və fəxri fərmanlarla təltif olunmuşdur. Ən cox sevdiyi isə SSRİ-nin “Fəxri rabitə ustası” adını daşımaq idi. 9 may 2003-cü ildə vəfat edib. Üç övladı var.

**Hüseynov Nürəddin Calal oğlu** 04 yanvar 1950-ci ildə Qasım İsmayılaov (indiki Goranbay) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi qurtarandan sonra (1957-1967) 3 saylı radiostansiyada elektromexanik kimi əmək fəaliyyətinə başlayıb (1967-1968). Hərbi xidmət keçəndən (1968-1970) sonra həmin müəssisədə işə davam edib. 1972-ci ildə Bakı Rabitə Elektron Texnikumuna qəbul olunub və oranı qiyabi olaraq 1975-ci ildə bitirb.

12 saylı Yevlax Rabitə qovşağında mühəndis (1974-1980), Qasım İsmayılov (indiki Goranboy) rayon Rabitə qovşağında mühəndis (1980-1991), Gəncə səhər Tele-Radio mərkəzində mühəndis vəzifələrində işləyib. Hal-hazırda Gəncə şəhər tele-radio yayım filalında mühəndis işləyir. Beş övladı var.



**Xoyluyev Ceyhun Rahib oğlu** 14 aprel 1961-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1969-cu ildə Gəncə şəhər N.Nərimanov adına 25 saylı orta məktəbin 1-ci sinfinə gedib və 1979-cu ildə həmin məktəbin onuncu sinfini bitirib. Orta məktəbi bitirdikdən sonra 1979-cu ildə Bakı Dövlət Universitetinin Fizika fakültəsinə qəbul olunub və 1983-cü ildə oranı bitirərək təyinatla Laçın rayonun Maqazin sovetliyinin Aquşdu kəndinə fizika-riyaziyyat müəllimi göndərilib. 1986-cı ilə kimi orada işləyib. 1986-cı ildən 2003-cü ilə kimi "Gülşən" kiçik müəssisəsində sahibkar işlə-yib. 2003-cü ildən hal-hazıra kimi Rusiya federasiyasında fərdi müəssəyə rəhbərlik edir. Üç övladı var.



**Xoyluyeva Cəlalət Mustafa qızı** 31 dekabr 1948-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1955-ci ildə Faxralı kənd orta məktəbin 1-ci sinfinə gedib və 1965-ci ildə həmin məktəbin onuncu sinfini bi-tirib. Faxralı kənd orta məktəbində laborant, məktəbin təsərrüfat müdiri vəzifələrində işləyib. 1995-ci ildən 2006-cı ilə kimi Faxralı kənd Uşaq bağçasında müdir vəzifəsində çalışıb. 2006-cı ildən səhhəti ilə əlaqədar təqaüdə çıxıb. Hal-hazırda təqaüdçüdür. İşlədiyi illərdə bir çox ictimai tədbirlərdə iştirak etmişdir və işi ilə bağlı bir neçə dəfə müdiriyyəti tərəfindən təşəkkürlər alıb. İki övladı var.



**Xoyluyeva Fatma Rahib qızı** 24 aprel 1965-ci ildə Qasım İsmayılaov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Gəncə şəhər

N.Nərimanov adına 25 saylı orta məktəbi bitirib (1972-1982). 1983-cü ildə Azərbaycan Texnologiya İnstitutuna qəbul olunub və 1988-ci ildə oranın "Təbii və kimyəvi liflərin əyrilməsi" ixtisasını bitirib. Gəncə şəhər Əyricilik Istehsalatında istehsalat təlimatçısı (1988-1991) və MÇET Xalça Firmasında sex növbə ustası (1991-2001) vəzifələrində işləyib. Hal-hazırda işsizdir. İki övladı var.



**Xoyluyev Sərraf Mustafa oğlu** 05 oktyabr 1950-ci ildə Qasım İsmayılaov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1957-ci ildə Faxralı kənd orta məktəbinin birinci sinfinə gedib və 1967-cı ildə həmin məktəbin onuncu sinfini bitirib. 1969-cu ildə Ukrayna SSR İvanofrankovsk vilayətində Aşbazlıq texnikumunu bitirib. Kirovabad (indiki Gəncə) şəhərində Alüminium zavodunun nəzdində Fəhlə Təchizat Şöbəsində Baş Aşbaz vəzifəsində işləyib (1970-1974). Kirovabad (indiki Gəncə) şəhərində Mədəni Maarif Texnikumunda Tar musiqi dərnəyini bitirib (1980). 1982-1999-cu illərdə Qasım İsmayılov rayonunun Faxralı kənd Mədəniyyət Evində bədii rəhbər və musiqi dərnəyinin rəhbəri işləyib. Faxralı kənd İcmasının fəal üzvü-lərindəndir. Yeni Azərbaycan Partiyasının üzvüdür. Keşirilən bir neçə seçkilərdə müstəqil müşahidəçi olub. İki övladı var.



**Xurşudov Fərman Səməd oğlu** 11 mart 1957-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi qurtarandan sonra (1961-1978) Azərbaycan Kənd Təsərrüfatı İnstituna qəbul olub və "kənd təsərrüfatının mexanikləşdirilməsi" ixtisasını bitirmişdir (1974-1979). Qasım İsmayılov rayonunun K.Marks (Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozunda təhlükəsizlik mühəndisi, avtomexanik işləyib (1980-1997). Kənd Təsərrüfatının Mexanikləşdirilməsi və Elektrikləşdirilməsi Elmi

Tədqiqat İnstitunun aspirantı olub (1987-1991). Hal-hazırda fərdi təsərrüfatla məşğuldur. Üç övladı var.



**İbrahimov Asif Calal oğlu** 29 iyul 1948-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1955-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə qəbul olub və 1966-cı ildə həmin məktəbin onuncu sinfini bitirib. Orta məktəbi bitirdikdən sonra 1966-cı ildə Ç.İldırım adına Azərbaycan Politexnik institutuna qəbul olub və 1972-ci ildə həmin institutun "toxuculuq sənayesi maşın və aparatları" ixtisası üzrə mexanika fakultəsini bitirərək mühəndis-mexanik adı alıb. 1962-cı ildən 1972-ci islədək ÜİLKGİ-nin üzvü və 1972-ci ildən Sov.İKP üzvü olub. Asif müəllim əmək fəaliyyətimə 04 oktyabr 1966-cı ildən başlayıb. 25 may 1967-ci ilədək V.Sturua adına Gəmiqayırma və Təmiri zavodunda fəhlə, çilingər və həmin ilin sentyabr ayından noyabr ayınadək "Qaradağ" Neftçıxarma İdarəsinin elektrik təsərrüfatı sexində elektrik montyoru işləyib. 1968-ci ildən 1973-cü ilədək Azərbaycan Daxili İşlər Nazirliyi yanında Yanğından Mühafizə İdarəsinin 2 saylı hərbiləşdirilmiş dəstəsində xidmət edib.O, 10 aprel 1973-cü ildən 26 oktyabr 1973-cü ilədək Kirovabad şəhəri S.Orconikidze adına Toxuculuq kombinatında detal sifarışçisi işlədikdən sonra hərbi xidmətə çağrılıb. 29 oktyabr 1973-cü ildən 1974-cü ilin dekabr ayına kimi Sovet ordusunda Zabaykal hərbi dairəsinin 51485 saylı hərbi hissəsində radiotelefonçu kimi xidmət edib. 24 dekabr 1974-cü ildən 02 iyun 1975-ci ilədək yenidən əmək fəaliyyətinə qayıdaraq S.Orconikidze adına Toxuculuq kombinatında istehsalat ustası, 08 iyul 1975-ci ildən 28 avqust 1981-ci ilədək Cihazqayırma zavodunda usta, 14 mart 1985-ci ilədək həmin zavodun azad partiya bürosunun katibi, 15 mart 1985-ci ildən Azərbaycan KP Kəpəz rayon komitəsində təşkilat şöbəsində təlimatçı, 1989-cu ildən 1990-cı ilədək KP Kəpəz rayon komitəsi ideoloji şöbəsində müdir müavini, 1991-ci ildə KP Kəpəz rayon komitəsində şöbə müdiri vəzifələrində, 1991-ci ildən 1992-ci ilədək Gəncə şəhər Təmir idarəsində texnik və 1992-ci ildən 2000-ci ilə kimi ƏM EY-də direktor müavini

vəzifələrində işləyib. 2000-ci ildən hal-hazıra kimi baş mexanik işləyir. Dörd övladı var.



**İbrahimov Hüseyn Calal oğlu** 29 avqust 1954-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1961-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1971-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. Orta məktəbi qurtarandan sonra Azərbaycan Kənd Təsərrüfat İnstituna qəbul olub və "Təşkilatçı iqtisadçı" ixtisasını bitirib. Oğuz rayonunun Xal-Xal kəndində iqtisadçı (1976-1978), K.Marks (keçmiş Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda iqtisadçı (1978-1990) işləyib. Sonra fərdi təsərrüfatla məşğul olub (1990-2002). 2002-ci ildən hal hazıra kimi Fermer təsərrüfatı başçısıdır. Başçılıq etdiyi təsərrüfatda işçiləri ilə birlikdə, Faxralı kənd əhalisinin bostan bitkilərinə olan tələbatını qismində olsa təmin edirlər. Dörd övladı var.

**Qurbanov Elmir Sahib oğlu** 12 fevral 1978-ci ildə Qasım İsmayılaov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1984-cü ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1995-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. O, orta məktəbi bitirdikdən sonra elə həmin il Azərbaycan Kənd Təsərrüfatı İnstitunun "elektromexanika" ixtisasını qəbul olub və 1999-cu ildə oranı bitirib. 2004-cü ildən 2008-ci ilə kimi Elmir müəllim Azərbaycan Müəllimlər İnstitutunun yenidən hazırlanma fakultəsinin "Riyaziyyat və İnformatika" fakultəsində ixtisas dəyişmə kursu keçib. Hərbi xidmətdə taqım komandiri vəzifəsində xidmət edib (2006-2008). Ehtiyatda olan baş leytenantdır. İki övladı var.



**Qurbanov Natiq Qurban oğlu** 06 dekabr 1952-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirib, sonra 1971-ci ildə Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun "Meyvə-tərəvəz və üzümçülük" fakültəsinə

qəbul olub və 1976 -cı ildə oranı bitirib. Ağsu rayonunun 1 May (Nuidi kəndi) adına kolxozunda baş aqranom (1976-1979), Qasım İsmayılov (indiki Goranboy) rayonunun Heyvandarlıq Sənaye Birliyində baş aqronom (1979-1981), Qasım İsmayılov rayonunun Bakı adına kolxozunda baş aqronom (1981-1993), Qasım İsmayılov rayonunun K.Marks (keçmiş Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozunda baş aqronom, islahat komissiyasının üzvü (1993-1999) vəzifələrində işləyib. 1999-cu ildən hal-hazıra kimi Faxralı kənd bələdiyyəsinin sədr müavini vəzifəsində işləyir. 1984-cü ildən Kommunist partiyasının, 1995-ci ildən isə YAP-ın üzvüdür. Dörd övladı var.



**Qurbanov Sahir Süleyman oğlu** 12 oktyabr 1957-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1965-1975-ci illərdə Faxralı kənd orta məktəbində oxuyub. Çexoslovakiyanın Klaşteres qəsəbəsində hərbi xidmət keçib (1976-1978). Qasım İsmayılov (indiki Goranboy) rayonunun K.Marks (keçmiş Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozunda kolxozçu işləyib (1979). Qiyabi olaraq S.Ağamalıoğlu adına Kənd Təsərrüfatı İnstitutunun "mexanikləşdirilmə" ixtisasını bitirib (1980-1985). Qasım İsmayılov rayonunun Dəliməmmədli qəsəbəsi Texniki Peşə məktəbində müəllim işləyib (1980-1995). 1996-cı ildən hal hazıra kimi fərdi olaraq kənd təsərrüfatı ilə məşğuldur. Bir neçə dəfə kənd təsərrüfatı məhsullarını, o cümlədən 2002-ci ildə günəbaxanı (1ha-dan 43 sentener) yüksək məhsuldarlıqla yığmışdır. İki övladı var.



**Məhərrəmov Saləddin Şurəddin oğlu** 1954-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1962-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1972-ci ildə həmin məktəbin onucu sinfini bitirib. 1973-1975-ci illərdə SSRİ SQ-də hərbi xidməti başa vurduqdan sonra, elə həmin ildə də Gəncə şəhər Rəssamlıq Texnikumuna qəbul

olub. 1979-cu ildə həmin təhsil ocaqının “Rəsm-Rəsmxət” müəllimi fakültəsini bitirib. 1979-1992-ci illərdə Dəliməmmədli qəsəbəsi peşə məktəbində və Faxralı kənd orta məktəbində müəllimlik edib. Saləddin müəllim gözəl əl qabilliyəti olan rəssam və dekorativ-tətbiqi sənətlə məşğul olan sənətkardır. Onun əl işləri bir neçə böyük sərgilərdə, o cümlədən Azərbaycan Turizminin nəzdində olan Bakı İslam Mədəniyyətinin Paytaxtıdır sərgisində, Norveçdə və İsveçdə keçrilən Qədim Azərbaycan Dekotariv Tətbiqi Sənət Nümunələri sərgisində, Gəncə şəhərdaxili və respublika əhəmiyyətli sərgilərdə sərgilənib. Hal-hazırda onun müəyyən əl işlərini qalareyalarda nümayiş etdirirlər. Azərbaycanlıların Rusiya diasporasının Leninqrad nümayəndəliyində Saləddin müəllimin əl işlərini sevərək saxlayır və təbliğ edirlər.

Hal-hazırda Gəncə şəhərində yaşayır. Saləddin müəllim öz elinə, obasına, kəndinə və vətəninə bağlılığını daim öz yaratdığı sənət əsərləri ilə bütün dünyaya çatdırır. Üç övladı var.



**Məmmədov Frazil Əliquzu oğlu** 15 ok-tyabr 1955-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra (1963-1973) K.Marks (keçmiş Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda kolxozçu işləyib (1974). Hərbi xidmət keçdikdən sonra (1974-1976) yenidən K.Marks (keçmiş Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda kolxozçu işləmişdir (1976-1979). Azərbaycan Kənd Təsərrüfat İnstitutunu bitirib (1979-1984). Qasım İsmayılov rayonunun K.Marks (keçmiş Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozunda baş aqronom, aqronom-entomoloq və sahə aqronomu vəzifələrində işləyib (1984-1997). 1997-ci ildən 1999-cu ilə kimi Fermer təsərrüfatı ilə məşğul olub. ABŞ-ın humanitar KA RE təşkilatında aqronom vəzifəsində işləyib (1999-2001). Goranboy rayonunun Faxralı bələdiyyəsinin üzvüdür, bələdiyyə vergi toplayanıdır (2002-2010). Hal hazırda Neft Şirkəti Azəri-Qaz istehsalat sahəsinin Goranboy rayon QİS-də 4 saylı Dəliməmmədli şəhər sahəsində nəzarətçi işləyir.



**Məmmədov Kərim Məzahim oğlu** 17 mart 1969-cu ildə Qasim İsmayılaov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini qurtarandan sonra (1976-1986) sənədlərini Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutunun aftomatika və hesablama texnikası fakültəsinə verib və həmin il qəbul olunub. 1987-1989-cu illərdə hərbi xidmətə getməsi ilə əlaqədar oxumağı müvəqqəti dayandırmışdır. 1989-cu ildə hərbi xidmətdən sonra institutun II kursuna bərpa olunaraq 1993-cü ildə Texniki Universitetin "Mühəndis sistema texnik" ixtisası üzrə tam kursunu bitirib. Hal-hazırda ticarətlə məşğuldur. 2006-cı ildən oruc tutub namaz qılır. 2008-ci ildə Həcc ziyarətində olub. Mədinə və Məkkə şəhərlərini ziyarət edib və tam hüquqlu Hacı adını alıb. Faxralı kəndində 1920-ci ildə Sovet höküməti yaranandan sonra bu günə kimi ilk Həcc əməlini yerinə yetirən şəxsdir. Üç övladı var.

**Məmmədov Zaur Tahir oğlu** 17 iyun 1971-ci ildə Qasım İsmayılaov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi bürünc medalla qurtarandan sonra Azərbaycan Kənd Təsərrüfatı İnstitutuna qəbul olub və "Alim-aqronom" ixtisasını "Fərqlənmə" diplomu ilə bitirib (1990-1994). Genetika və Seleksiya İnstitutunun aspirantı olub (1994 -1995). Elmi rəhbəri Adilə xanım olub. Hal-hazırda fərdi təsərrüfatla məşğuldur.



**Məmmədov İsmət Tahir oğlu** 29 aprel 1974-cü ildə Qasım İsmayılaov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi qurtarandan sonra Azərbaycan Kənd Təsərrüfatı İnstitutuna qəbul olunub və institutun "Alim-aqronom" ixtisasını bitirib (1991-1996). Hərbi xidmətdə taqım komandiri vəzifəsində xidmət edib (2008-2010). Ehtiyatda olan baş leytenatdır. Hal-hazırda fərdi təsərrüfatla məşğuldur. İki övladı var.



**Musayev Bəxtiyar Şəmil oğlu** 27 noyabr 1957-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1965-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə qəbul olub və 1975-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1975-ci ildən 1976-cı ilə kimi K. Marks (keçmiş Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda kolxozçu işləyib və 1976-cı ilin may ayında hərbi xidmətə çağrılıb. Hərbi xidməti Sovet Ordu sıralarının tərkibində Çexoslavakiyanın Zvolen şəhərində keçib və 1978-ci ildə ordu sıralarından tərxis olunub. O, 1979-cu ildə Azərbaycan Kənd Təsərrüvatı İnstitutunun Zoomühəndislik fakültəsinin əyani şöbəsinə qəbul olub və 1984-cü ildə həmin institutu qurtararaq təyinatla K.Marks (keçmiş Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda zootexnik vəzifəsində işə başlayıb. 1984-1990-cı illərdə həmin kolxozda sahə zootexniki, 1990-1996-ci illərdə baş zootexnik vəzifələrində işləyib. 1996-cı ildən 1999-cu ilə kimi təsərrüfat birliyində işləyib. 1999-cu ildə bələdiyyə seçkiləri zamanı bələdiyyə üzvü seçilib və 2004-cü ilə kimi Faxralı bələdiyyəsində bələdiyyə sədri və 2008-2009-cu illərdə Azərbaycan Respublikası İqtisadi İnkişaf Nazirliyi yanında İstehlak Bazarına Nəzarət üzrə Dövlət Xidmətinin Gəncə-Qazax Regional Sektorunun Ekspertiza Bürosunda məsləhətçi vəzifələrində işləyib. Hal-hazırda təsərrüfat işlərində çalışır. Üç övladı var.



**Musayev Maris Qara oğlu** 30 mart 1956-cı ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra Kirovabad (indiki Gəncə) Pedaqoji İnstitutuna daxil olub (1973) və oranın "Fizika-riyaziyyat" fakultəsini bitirib (1977). Lənkəran rayonunun Separadi kənd məktəbində müəllim (1977-1980), Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kənd orta məktəbində müəllim və direktor müavini işləyib (1980-1993). 1993-cü ilin sentyabr ayından hal-hazıra kimi Goranboy rayonunun İcra

Hakimiyyəti başçısının Faxralı kənd nümayəndəliyində müavin vəzifəsində işləyir. YAP-ın üzvüdür. YAP-nın Faxralı kənd ilk partiya təşkilatının sədridir.  Üç övladı var.



**Musayev Müharib İsa oğlu** 01aprel 1943-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Kirovabad şəhərində Toxuculuq Texnikumunun “Xammalın ilk emalı texnoloq və avadanlığı” ixtisasını” (1960-1963) və H.Zərdabi adına Kirovabad Pedaqoji İnstitutunun “Biologiya” ixtisasını qiyabi olaraq bitirib. Qasım İsmayılov rayonunun Dəliməmmədli qəsəbəsində Pambıqtəmizləmə zavodunda III və I zonalar üzrə əmtəəşünas (1963-1973), baş əmtəəşünas (1973-1990), xammal və hazır mallar şöbəsinin rəisi (1990-1997), əmtəəşünas, xammal və hazır mallar şöbəsinin rəisi vəzifələrində işləyib (1997-2008). **“Əmək veteranı”** medalı ilə təltif olunub (1978).  Hal-hazırda təqaüdçüdür. Dörd övladı var.



**Musayev Rövşən Müharib oğlu** 13 fevral 1980-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1986-cı ildə Faxralı kənd orta məktəbinin birinci sinfinə gedib və 1997-ci ildə həmin məktəbin on birinci sinfini bitirib. Orta məktəbi bitirdikdən sonra fərdi təsərrüfatla məşğul olmaqla yanaşı ali məktəbə qəbul imtahanlarınada hazırlaşaraq, 1998-ci ildə İqtisad Universitetinin “Standartlaşdırma və sertifikatlaşdırma” ixtisasına qəbul olub və 2002-ci ildə həmin universitetin bakalavr pilləsini qurtarıb. 2002-ci ildə İqtisad Universitetinin magistiraturasına qəbul olub və 2004-cı ildə bakalavr ixtisasının magistiratura pilləsinidə bitirib. Rövşən müəllim Faxralı kəndində magistir dərəcəsini almış ikinci şəxsdir. Ticarətlə məşğuldur. Məşğul olduğu ticarət sahəsində bir neçə şəxslərə də işləmək imkanı yaradaraq, onları işlə təmin edib. Üç övladı var.



**Musayev Səfayil Şəmil oğlu** 07 oktyabr 1964-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1971-ci Faxralı kənd orta məktəbinin 1-ci sinfinə qəbul olub və 1981-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. 1982-ci ildə Ukrayna dövlətinin Dnepropetrovsk şəhərində Politexnik institutunun Maşınqayırma mühəndisliyi fakültəsinə qəbul olub və 1987-ci ildə həmin institutu tam kurs üzrə qurtararaq Gəncə şəhəri Maşınqayırma zavoduna təyinat alıb. Səfayil müəllim az müddət sonra Rusiya dövlətinin Nijni-Novqorod şəhərinin QAZ-zavoduna təyin olunub. 1988-ci ildən 1995-ci il tarixə kimi orada mühəndis vəzifəsində çalışıb. Yenidən Nijni-Novqorod Dövlət Universitetinin "Hüquq" fakültəsinə daxil olub və oranı bitirdikdən sonra müxtəlif Hüquq orqanlarında hüquqşünas kimi işləyib. Hal-hazırda Rusiya vətəndaşıdır və fərdi biznes işləri ilə məşğuldur. Üç övladı var.



**Mustafayev Məlik Mustafa oğlu** 27 yanvar 1961-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Orta məktəbi qurtarandan sonra (1961-1978) Azərbaycan Kənd Təsərrüfatı İnstituna qəbul olub və oranı baytarlıq ixtisası üzrə bitirib (1978-1983). İnstitutu bitirdikdən sonra təyinatla Qasım İsmayılov (indiki Goranboy) rayonuna göndərilib. Dəliməmmədli qəsəbəsində baytarlıq sahəsində müdir, Əzizbəyov kəndində baytarlıq sahəsində müdir, Hazırəhmədli kəndində baytarlıq sahəsində müdir vəzifələrində işləyib. 1990-cı ildən hal-hazıra kimi Dəliməmmədli şəhəri Texniki Peşə məktəbində müəllim işləyir. Texniki Peşə məktəbində YAP-ın sədridir. Üç övladı var.



**Nəbiyev Çingiz İsrafil oğlu** 03 avqust 1955-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1962-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1972-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. Məktəbi qurtardıqdan sonra K.Marks (keçmiş Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda işləyib (1972-1973). Kirovabad (indiki Gəncə) şəhəri Politexnik Texnikumunun "Elektrik avadanlıqları" ixtisasını qiyabi olaraq bitirib (1976-1980). Kirovabad (indiki Gəncə) şəhər İstilik-Elektrik mərkəzində maşınist köməkçisi (1976-1977), qazan sexində baş maşınist (1977-1980), komsomol komitəsinin katibi (1976-1980), Həmkarlar təşkilatının sədri (1980-1996), Mülki müdafiə qərərgahının rəisi (1990-1996) vəzifələrində işləyib. 1996-cı ildən hal-hazıra kimi qazan sexində növbə rəisi işləyir.

**"Leninin 110 illiyi"** fəxri fərmanı (1980), **"Beşilliyin Gənc Qvardiyaçısı"** döş nişanı, **"Kommunist Əməyi Zərbəçisi"** döş nişanı (1981), **"On Birinci Beşilliyin Gənc Qvardiyaçısı"** döş nişanı (1982), **"Kommunist Əməyi Zərbəçisi"** döş nişanı (1982), **"Kommunist Əməyi Zərbəçisi"** döş nişanı (1984), **"On Birinci Beşilliyin Zərbəçisi"** döş nişanı (1984), **"Ağıllı-Usta"** döş nişanı (1984), **"On Birinci Beşilliyin Gənc Qvardiyaçısı"** II dərəcəli döş nişanı (1985), **"Səmərələşdirmə və Kəşf Əlaçısı"** döş nişanı (1985), **"Əmək Şöhrəti"** III dərəcəli ordeni (1986), **"Kommunist Əməyi Zərbəçisi"** döş nişanı (1988), **"QOELRO 70 illiyi"** döş nişanı ilə və eləcə də şəhər, rayon komsomol komitəsi tərfindən 4 dəfə **"Fəxri fərmanla"**, idarə və müəssisə tərəfindən 7 dəfə **"Fəxri fərmanla"** təltif olunub.

Hərbi xidməti Almaniyada keçirib. Xidməti illərində SSRİ SQ komandanlığı tərəfindən dörd dəfə **"Fəxri fərmanla"** təltif edilib. "Kiçik leytenant" rütbəsi ilə istefada olan zabitdir. Hal-hazırda Gəncə şəhərində yaşayır. Dörd övladı var.



**Nəbiyev Əsgər İsrafil oğlu** 1952-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olmuşdur. 1959-cu ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1969-cu ildə həmin məktəbin onuncu sinfini bitirib. Məktəbi qurtarandan sonra Azərbaycan Politexnik İnstitunun topoqrafiya ixtisasına qəbul olub və institutun II kursundan sonra Ukrayna Respublikasının Kirovqrad şəhərində təhsilini davam etdirib. 1974-cü ildə institutu bitirdikdən sonra Ukrayna Respublikası Kirovqrad şəhəri Radiomexanika zavoduna işə qəbul olunmuşdur. Eyni adlı zavodda fəhlə, sex rəisi, mühəndis və zavod rəisinin müavini vəzifələrində işləyib. İşlədiyi zavodda komsomol komitəsinin katibi, sonralar isə zavod üzrə partiya komitəsinin katibi ictimai vəzifələrində də çalışmışdır. Ukraynada evlənib. İki övladı olub və kiçik övladının vaxtsız vəfatına tab gətirə bilməyib 2008-ci ildə vəfat edib. Faxralı kənd qəbristanlığında dəfn edilib.



**Süleymanov Ədalət Abdulla oğlu** 10 mart 1954-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1961-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1971-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. Azərbaycan Kənd Təsərrüfatı İnstitutuna daxil olub, iqtisadçı-mühasib ixtisası üzrə həmin institutu bitirib (1973-1980). Hərbi xidmətdən sonra (1973-1975) Qasım İsmayılov (indiki Goranboy) rayonunun Statistika idarəsində mühasib, sonra isə rəis vəzifəsində işləyib (1976-1979). Xanlar adına kolxozda baş mühasib (1979-1984), 1 saylı UTT-nin Mexanikləş-dirmə idarəsində baş mühaib (1984-1987), K.Mraks (keçmiş Faxralı, Alpout, Qurbanzadə kəndləri) adına kolxozda iqtisadçı, baş iqtisadçı və baş mühasib (1987-2001) vəzifələrində işləyib. 2001-ci ilin avqust ayından hal hazıra qədər Faxralı kənd bələdiyyəsində mühasib vəzifəsində işləyir. 2002-ci ildən 96 saylı Goranboy-Naftalan seşki Dairəsinin 22 saylı Faxralı kənd Məntəqə Seçki komissiyasının sədridir və həm də Faxralı İcma Qrupunun rəhbəridir. İcma

Qrupunun rəhbəri olduğu müddətdə icma ərazisində 2,5 km yol çəkilmiş və bir artezian quyusu vurulmuşdur. Üç övladı var.



**Yusifov Cavid Əbdülrəhman oğlu** 1949-cu ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. Faxralı kənd orta məktəbini bitirdikdən sonra 1972-ci ildə H.Zərdabi adına Kirovabad (indik Gəncə) Pedaqoji İnstitutuna qəbul olunub və 1976-cı ildə oranı bitirib. 1980-ci ildə Bakı Ali Partiya Məktəbini bitirib. Qasım İsmayılov (indiki Goranboy) rayonunun Komsomol Komitəsinin katibi və ikinci katibi (1976-1979), Rayon Partiya Komitəsinin təlimatçısı (1980-1982) və Qasım İsmayılov rayonunun Karl Marks adına kolxozunda Azad Partiya Komitəsinin katibi (1982-1990) vəzifələrində işləyib. Hal-hazırda fərdi təsərrüfatla məşğuldur. Dörd övladı var.



**Yusifov Cuma Əli oğlu** 6 noyabr 1959-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1967-ci ilə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1977-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. Orta məktəbi bitirdikdən sonra Kirovabad (Gəncə) şəhərində bərbər Qəhrəman ustanın yanında şagirdlik edərək bərbərlik sənətinə mükəmməl yiyələnib. 1978-1980-ci illərdə Rusiyanın Altayskaya vilayətində Daxili Qoşunların tərkibində hərbi xidmətdə olub. 1980-ci ildən hal-hazıra kimi Gəncə şəhərində bərbər işləyir. Gözəl ustalığı sayəsində Cuma Gəncə şəhərində sayılıb seçilən bərbərlərdən biridir. O, bərbərliyi dövründə bir neçə gözəl bərbərlər yetişdirmişdir, o cümlədən bərbərlik sahəsində faxralılardan Pərviz, Emin, Sərxan, Eyvaz və Amil kimi usta bərbərlərə ustalıq edərək onlara bu sənəti mükəmməl mənimsəməklərində böyük köməklik göstərmişdir. İki övladı var.



**Yusifov Nəriman Əli oğlu** 19 may 1965-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1972-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə daxil olub və 1982-ci ildə həmin məktəbin onuncu sinfini müvəffəqiyyətlə bitirib. Orta məktəbi qurtardıqdan sonra sənədlərini Moskva Poladəritmə İnstitutuna verib. Qəbul imtahanlarından müvəffəq qiymət alan Nəriman müəllim həmin institutun tələbəsi olmaq şərəfinə nail olub. 1984-cü ildə hərbi xidmətə çağrılan Nəriman müəllim təhsilini yarımçıq qoyaraq Sovet ordusu sıralarında qulluq edib. 1986-cı ildə hərbi qulluğu başa vurduqdan sonra ailə vəziyyəti ilə əlaqədar Azərbaycan Texniki Universitetinin metallurgiya fakultəsinin 2-ci kursuna dəyişilib. Təhsilini başa vurduqdan sonra gənc mütəxəssis kimi Gəncə Gil Torpaq Kombinatına göndərilib. Hal-hazıra kimi kombinatda müxtəlif vəzifələrdə çalışıb. Üç övladı var.

# ÇERNOBIL FACİƏSİ VƏ QARABAĞ MÜHARİBƏSİ ƏLİLLƏRİ

**Hacıyev Xudayar Mövsüm oğlu** 1975-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1981-ci ildə Faxralı kənd orta məktəbinə gedib və 1991-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. Hərbi xidmətə çağrılan Xudayar 1995-ci ildə Füzuli rayonun müdafiəsi uğrunda gedən döyüşlərdə yaralanmışdır. III dərəcəli əlildir.



**Xoyluyev Elşən İbrahim oğlu** 25 yanvar 1968-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1975-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1985-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. Ukrayna Respublikası ərazisində yerləşən Çernobıl

Atom Elektrik  Stansiyasında 26 aprel 1986 -cı ildə baş verən qəzanın aradan qaldırılmasında iştirak edib. Mingəçevir şəhər polis şöbəsində polis nəfəri işləyib (1989-1997). II dərəcəli Çernobıl əlilidir. Hal-hazırda fərdi təsərrüfatla məşğuldur. İki övladı var.

**İbrahimov Səbuhi Madil oğlu** 1967-ci ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1975-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1985-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. Ukrayna Respublikası ərazisində yerləşən Çernobıl Atom Elektrik  Stansiyasında 26 aprel 1986-cı ildə baş verən qəzanın aradan qaldırılmasında iştirak edib. Hal-hazırda fərdi təsərrüfatla məşğuldur. II dərəcəli Çernobıl əlilidir. Üç övladı var.

**Məmmədov Nəsif Dəmir oğlu** 1959-cu ildə Qasım İsmayılov (indiki  Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1966-cı ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1976-cı ildə həmin məktəbin onuncu sinfini bitirib. Ukrayna Respublikası ərazisində yerləşən Çernobıl Atom Elektrik  Stansiyasında 26 aprel 1986-cı ildə baş verən qəzanın aradan qaldırılmasında iştirak edib. Hal-hazırda fərdi təsərrüfatla məşğuldur. II dərəcəli Çernobıl əlilidir.

**Musayev Xəzail Vadil oğlu** 1973-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1980-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1990-cı ildə həmin məktəbin onuncu sinfini bitirib. 1993-cü ildə Qarabağ uğrunda gedən döyüşlərdə iştirak edib və mərmi partlayışından çoxsaylı qəlpə yaraları alıb. Hal-hazırda fərdi təsərrüfatla məşğuldur. II dərəcəli Qarabağ Müharibəsi əlilidir.

**Süleymanov Nemət Abdulla oğlu** 1966-cı ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olub. 1972-ci ildə Faxralı kənd orta məktəbinin 1-ci sinfinə gedib və 1982-ci ildə həmin məktəbin onuncu sinfini bitirib. Qarabağ müharibəsi iştirakçısıdır. 1992-ci ildə Goranboy rayonunun Ağcakənd qəsəbəsi uğrunda gedən döyüşlərin birində gözündən yaralanmışdır. II dərəcəli Qarabağ Müharibəsi  əlilidir.

# ŞƏHİDLƏR



**Kosayev Yusif Zabit oğlu** 1955-ci ildə Kirovabad (indiki Gəncə) şəhərində anadan olub. Orta məktəbi də Kirovabad şəhərində oxuyub qurtaran Yusif Qarabağ uğrunda gedən müharibədə mənfur erməni təcavüzkarlarına qarşı döyüşlərdə iştirak edib və düşmənə aman verməyib. 1990-cı ilin yanvar ayında Çaykənd uğrunda gedən döyüşlərin birində Yusif aldığı ağır güllə yarasından əbədi gözlərini yumaraq şəhidlik zirvəsinə ucaldı. Yusif Gəncə şəhəri fəxri xiyabanında dəfn edilib.



**Rəhimov Yaşar Ağalar oğlu** 12 yanvar 1947-ci ildə Qasım İsmayılov (indiki Goranboay) rayonunun Faxralı kəndində anadan olmuşdur. Orta təhsil aldıqdan sonra Kirovabad (indiki Gəncə) şəhərində texniki peşə məktəbini bitirmiş, Kirovabad (indiki Gəncə) şəhər Enerji təchizat şöbəsində işləmişdir. Goranboy rayonunun könüllülər batalyonuna yazılmış (01 dekabr 1991), rayon ətrafında gedən döyüşlərdə iştirak etmişdir. Todan kəndi uğrunda  gedən döyüşlərdə aldığı ağır güllə yarasından şəhid olmuşdur (28.12.1991). Yaşadığı Dəliməmmədli şəhərində dəfn edilmişdir. Üç övladı var.

Dəlməmmədli şəhərində küçələrdən biri onun adını daşıyır.



**Sadıqov Teymur Alim** oğlu 15 may 1974-cü ildə Qasım İsmayılov (indiki Goranboy) rayonunun Faxralı kəndində anadan olmuşdur. Orta məktəbi bitirdikdən sonra Gəncə Maşınqayırma Texnikumuna daxil olmuşdur. 1993-cü ildə Goranboy rayon Hərbi Komisarlığı tərəfindən hərbi xidmətə çağrılmışdır. Goranboy torpaqlarını erməni quldurlarından təmizlənməsində iştirak etmişdir. Rayonun Tapqaraqoyunlu kəndi uğrunda gedən döyüşlərində mərmi partlayışı nəticəsində aldığı ağır qəlpə yaralarından şəhid olmuşdur (09.05.1994). Faxralı kəndində dəfn edilib. Subay idi.

Faxralı kənd orta məktəbi onun adını daşıyır.

# Foto albom



Ulu öndərimiz Heydər Əliyev Qurban Qurbanovu təltif edir



1932-ci il Faxralılar



**Məşədi Nağı** (1890-1933) - dövrünün ziyalısı, ərəb, fars və türk dillərini bilmiş, Gəncəbasar qazisinin Faxralı kəndi üzrə nümayəndəsi. Sovet dövründə Murquzallar kəndində kolxozda mühasib işləmişdir.



1940-cı il. Faxralı məktəbliləri



1940-cı ildə Faxralı orta məktəbinin əlaçıları



Solda Nağdal oğlu İsmail, Güləhməd bəy oturan  Məşədi Musa bəy.



Soldan ayaq üstə Qədir, Eyyub(Qənbərin qardaşı)  oturanlar Mehralı və Yaqub(Yusifin atası)




1946-cı il. Faxralı məktəblilərinin buraxlış sinfi



1930-cu il. Oturanlar Qara Müseyib və Yusif



soldan ayaq üstə Abdillayev Abdulla Alı oğlu, Hüseynov Abdulla Mədətoğlu, oturan Xudaverdiyev Alı Abdulla oğlu, Yolçuyev Yusif İsmayıl oğlu 07 noyabr 1931



soldan Ağalar İsmayılov, Əsəd Məmmədov,
Xanlar Əhmədov və İsax Məmmədov



21 aprel 1941-ci il oturan Məmmədov Qoşqar



Soldan Hacıyev Binnət



Sarı Göyüş nəvələri ilə




20.07.1964-cü il.  Ərşad, Anaxanım və Tapdıq



1998-ci il. Mələksuma və nəticələri Vüsal və Rövşən.



Solda Həbib sağda Məhəmməd



Soldan Gülsüm,Mirvari, Sənubər və Kafya



Soldan Yurik, Ərəstun və Qeys



Ortada Mirzə Fatma solunda Rahibin yoldaşı Familə



Ziyabil, İbrahim və tələbə dostları




Reyhan, Gülzad və Yasəmən



2010-cu il. Soldan Əliqılınc və İqaf



Turab, Maruz, Səmayə.



1956-cı il  Faxralı məktəbliləri.



Faxralı kəndinin əhalisi toyda



Sosialist Əməyi Qəhrəmanı Bəşir Musazadə  həyat yoldaşı ilə



Solda Cəlil sağda Sosialist Əməyi Qəhrəmanı Mansur Kərimov



Solda Qəhrəman və İlyas.



Solda  Alı, Aslan, Bayram uşaqlardan Firdovsi,
Səyyaf, Feruz, Novruz, Əsgər, Afət və Gülafət.



Qara Müseyib



Həmdulla



İbrahim



Hacıyev Yusib



İman



Mustafa



Sitarə



Fireyzə



Lətifə



Böyükişi



Ədil oğlu Şükürlə
(Rəfinin dayısı)



Gülöyşə



Dilənçi



Şəkilə baxanda soldan ayaqüstə Tapdıq, Nürəddin, Şəmil, Rahib oturanlar Bayram, Alı və





Rəssam, Saləddin müəllimin taxta üzərində oyma əl işləri





Rəssam, Saləddin müəllimin taxta üzərində oyma əl işləri

## Faxralı şairlərinin şeirləri

### Faxralı

Goranboy elində, Kürəkbasarda,
Bir obadı, səfalı kənddi Faxralı.
Şöhrəti yayılıb hər bir diyarda,
Dostluqda vəfalı kənddi Faxralı!

Alimi, həkimi, mühəndisi,
Əmək qəhrəmanı, zabitləri var,
Ziyalısı hər məqamda tanınar,
Ağsaqqal hörməti uca tutular
Fəzilətdi, əhli-haldı Faxralı!
Zəkalıdır, xoş amaldır Faxralı!

Bol olur bu yerin bəhəri, barı,
Üzümü, ənciri, heyvası, narı,
Meyvəli, kölgəli tut ağacları,
Hər çeşid neməti, hər cür nübarı,
Şəkərdi, şərbətdi, baldı Faxralı!
Hava, su, torpağı ləldi Faxralı!

Bu torpaq yetirib çox nazlı sənəm,
Heç kəs inciməsin ad çəkəmmərəm,
Hər qızı, gəlini, gözəl güləndam,
Vəfalıdı, şirin dildi Faxralı!
Qızlarına hamı əsirdi Faxralı!
Xudam bilər bu nə sirdi Faxralı!

Aləmə səs saldı Camal qaqası,
Kişilər kişisi, igidlər xası,
Şəhri qarı kasıbların anası,
Dəmlədi plovu, bişdi dolması,
Bəy, xan süfrəsini saldı Faxralı!
Çörəkli adını aldı Faxralı!

Qaçaq Kərəm qonaq oldu bu yerdə
İrana etdiyi məşhur səfərdə,

İgidlər yarışdı bu görüşlərdə,
Cəsarət meydanı oldu Faxralı!
Xayatını nişan aldı Faxralı!
Mərc qalibi Camal oldu, Faxralı!

Neçə Kərbəlayı, Məşədi, Hacı,
Oldular bu kəndin səxavət tacı,
Namərdə, nakəsə vermədi bacı,
Aldı ağuşuna qərib, möhtacı,
Yaşadı, böyüdü, doldu Faxralı!
Abad, yaraşıqlı oldu Faxralı!

Cahan savaşında 64 igid,
Canlarından keçib oldular şəhid,
Gör neçə qapıya vuruldu kilid,
Gör neçə ocaqda qırıldı ümüd,
Dul qaldı gəlinlər soldu Faxralı!
Ağladı saçını yoldu Faxralı!

Qarabağ savaşı qeyrət meydanı,
Döyüşə səsləyir Azərbaycanı,
Töküldü xalqımın günahsız qanı,
Xocalı lərzəyə saldı dünyanı,
Yusif, Yaşar, Teymur bu üç cavanı,
Oldu təcavüzün acı qurbanı,
Şəhidlik sədası aldı Faxralı!
Dilqəmi, Kərəmi caldı Faxralı!
Vətəndaşlıq dərsi aldı Faxralı!

Neçə gənc qovuşur hər ay nigaha,
Zəmanət yaranır nurlu sabaha,
Əlövsət Faxralı şükür Allaha,
Bu yurdda əbədi qaldı Faxralı!
Qaladı, qayadı, saldı Faxralı!
Min evli, ocaqlı eldi Faxralı!
Birlik olan yerdə seldi Faxralı!

**Əlövsət müəllim**

## Tardadır!

Həyat çeşməsinin abı-kövsəri,
Məhəbbətin min dastanı tardadır.
Sənət dünyasının min şah əsəri,
Muğamatın tər bostanı tardadır!
Muğamların pak lisanı tardaır!

Bayatı-İsfahan, Bayatı-Qacar,
Dinlə Çahargahı qəlbində vüqar,
Tar gəlsə məclisə min büsat qurar,
Ariflərin toy-bayramı tardadır.

Bir zaman sevməyib onu bədxahlar,
Sus deyə bağırıb yaltaq-məddahlar.
Müşfiq meydan açıb susma “oxu tar”,
Millətimin qanı, canı tardadır.

Muğamat fəth edir duyan ürəyi,
Tardır musiqinin qızıl dirəyi,
Xalqımın arzusu, eşqi, diləyi,
Sənətimin gülüstanı tardadır.
Tar el nəfəsidir, el həvəsidir,
Hər qalxan nidası əsrin səsidir,
Ləhcəsi çox şirin yar ləhcəsidir,
Əlövsətin eşq-ilhamı tardadır.

**Əlövsət müəllim**

## Ağlar

Sən ey nazəninim, məni unutsan,
Təbiət yas tutar, mələklər ağlar.
Sən mənə şəfasan, sən mənə dərman,
Təbibsiz, dərmansız, xəstələr ağlar.

Ürək nidasını söylədim sənə,

Təbəssüm eyləyib bircə gülsənə,
Axan göz yaşımı canan silsənə,
Ürək ki, daş deyil, kövrələr ağlar.

Gözümdə intizar, can deyər dilim,
Həftəm ilə dönər, ay olar günüm,
Əyilər qamətim, bükülər belim,
Qocalıq yük olar, çəliklər ağlar.

Gəl məni sınama hicranla gülüm,
Qəm, kədər içində sönər gənc ömrüm,
Dərd tüğyan eyləyər, çatar son günüm,
Arzular puç olar, diləklər ağlar.

Əlövsət söylədi ürək sözünü,
Aşiqəm, sevirəm, o ay üzünü,
Həsrətin yollara dikər gözümü,
Gündüzlər yol çəkər, gecələr ağlar.

**Əlövsət müəllim**

## Gözlərinin sevinci

İradəm, cəsarətim.
Eşqim, həm səadətim,
Mənliyim, heysiyyətim,
Gözlərinin sevinci!
Hər şeydən gözəl inci!
Həyatım, məhəbbətim,
Ən şirin ülviyyətim,
Ən təmiz, pak niyyətim,
Gözlərinin sevinci.
Çiçəkli arzularım,
Rayinəli baharım,
Ən gözəl, xoş nübarım,
Gözlərinin sevinci.
Mənalı gəlcəyim,
Qanadlanan diləyim,

